QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

May 2018 № 5 (1092)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Akademik Cəlal Əliyevin 90 illik yubileyinin keçirilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



2018-ci ilin iyun ayında Azərbaycanın görkəmli alimi, tanınmış ictimai xadim, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü, əməkdar elm xadimi, biologiya elmləri doktoru, professor Cəlal Əlirza oğlu Əliyevin anadan olmasının 90 illiyi tamam olur.

Akademik Cəlal Əliyev fundamental araşdırmaları və elmi nailiyyətləri ilə Azərbaycanda biologiya elminin bir sıra yeni istiqamətlərini müəyyənləşdirmiş və onun aktual problemlərinin həllinə sanballı töhfələr vermişdir. Alimin nəzəriyyə və təcrübənin vəhdətini daim əsas götürməklə qazandığı nəticələrin tətbiqi respublika iqtisadiyyatının inkişafı və məhsuldarlığın yüksəldilməsi baxımından böyük əhəmiyyət kəsb etmişdir. Cəlal Əliyevin ölkədə bioloji müxtəlifliyin mühafizəsi və səmərəli istifadəsi strategiyasının işlənib hazırlanmasında mühüm xidməti vardır. Yetirmələri dünyanın müxtəlif tədqiqat mərkəzləri və tədris ocaqlarında bu gün də uğurla çalışan alim mötəbər beynəlxalq elmi təşkilatlarla əlaqələrin qurulması və Azərbaycan elminin nailiyyətlərinin tanıdılması üçün təqdirəlayiq işlər görmüşdür.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycanda biologiya elminin inkişafında, müasir kadr potensialının formalaşdırılmasında və ümumən elmin təşkilində uzunmüddətli ardıcıl fəaliyyətini nəzərə alaraq akademik Cəlal Əliyevin 90 illik yubileyinin keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Milli Elmlər Akademiyası Azərbaycan Respublikasının Kənd Təsərrüfatı Nazirliyi ilə birlikdə akademik Cəlal Əliyevin 90 illiyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 22 may 2018-ci il*

## «Heydər Əliyev və Azərbaycanda intellektual potensialın inkişaf dinamikası" Respublika elmi konfransı

**Mayın 1-də Səbail Rayon İcra Hakimiyyətinin, Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) birgə təşkilatçılığı ilə ADPU-nun Heydər Əliyev məktəbinin lektoriyasında "Heydər Əliyev və Azərbaycanda intellektual potensialın inkişaf dinamikası" Respublika elmi konfransı keçirilib. Tədbirdə rayon rəhbərliyi ilə yanaşı müxtəlif dövlət qurumların nümayəndələri, Milli Məclisin üzvləri, elm, təhsil və din xadimləri, ziyalıların, gənclərin, ağsaqqalların, veteranların və ictimaiyyətin, YAP-ın Səbail rayon təşkilatının təmsilçiləri iştirak ediblər.**

Əvvəlcə konfrans iştirakçıları ADPU-da xalqımızın ümummilli lideri, müasir müstəqil dövlətimizin memarı və qurucusu Heydər Əliyevin heykəli önünə gələrək xatirəsini ehtiramla yad edib, önünə əklil və tər çiçəklər düzüblər.

Konfransda giriş sözü ilə çıxış edən Səbail Rayon İcra Hakimiyyətinin başçısı Eldar Əzizov qeyd edib ki, Heydər Əliyev və Azərbaycan sözləri hər bir azərbaycanlı üçün müəyyən mənada eyni məna daşıyan sözlərdir. Təbiidir ki, bu gün birmənalı şəkildə demək olar ki, Heydər Əliyev olmasaydı, müasir Azərbaycan dövləti də olmazdı. Ulu Öndərin Azərbaycana rəhbərlik etdiyi 30 ilin hər bir ili görülən işlər və əldə olunan nailiyyətlərə görə əhəmiyyətli il olmuşdur.

Bəşər tarixində nadir insanlar var ki, onların həyat və fəaliyyətləri bütün millətin və xalqın, dövlətin taleyini həll etmiş olsun. Onlardan biri sözsüz ki, Heydər Əliyevdir. Azərbaycanın tarixində çoxlu sayda görkəmli dövlət xadimləri və böyük şəxsiyyətlər vardır. Lakin yalnız Heydər Əliyev Azərbaycan xalqının, millətinin lideri kimi tarixə daxil olmuşdur.

Qədirbilən xalqımız dahi şəxsiyyətin ölkəmizin inkişaf və tərəqqisi üçün gördüyü işləri yüksək qiymətləndirir və buna görə də Ulu Öndərin 95 illik yubileyi Azərbaycanın hər yerində ümumxalq bayramı kimi qəbul olunur.









Heydər Əliyevin Azərbaycan qarşısında ən böyük xidmətlərindən biri müstəqil dövlətimizin yaradılması və özünə layiqli siyasi varis olan İlham Əliyevin hazırlanması olmuşdur. Ulu Öndərin ölməz ideyalarını, siyasi kursunu ləyaqətlə davam etdirən möhtərəm Prezidentimiz İlham Əliyev Azərbaycanda misli görünməmiş inkişaf və tərəqqi siyasətini həyata keçirən şəxsiyyət kimi artıq ölkə tarixində təsdiq olunub. Ulu öndər Heydər Əliyevin əsasını qoyduğu, Prezident İlham Əliyevin böyük məharətlə davam etdirdiyi siyasi xətt hazırkı çox mürəkkəb dövrdə yeganə və alternativsiz siyasət olduğu üçün Azərbaycanın gələcək inkişaf və tərəqqisinə təminat verir.

Eldar Əzizov vurğulayıb ki, məhz Prezident İlham Əliyevin yüksək intellekti sayəsində bu gün Azərbaycan sürətlə inkişaf edir və müstəqilliyini qoruyub saxlayıb. Hazırkı mürəkkəb dövrdə Azərbaycan kimi ölkənin müstəqilliyini qoruyub saxlamağı, onu inkişaf etdirməyi, dünyaya yeni iqtisadi-siyasi siyasət modeli kimi təqdim etməyi, balanslaşdırılmış siyasət yürütməyi yalnız xüsusi istedada malik olan insanlar edə bilərlər və bu gün Azərbaycanda belə insan sözsüz ki, cənab İlham Əliyevdir.

Konfransda çıxış edən YAP-ın Səbail rayon təşkilatının sədri, Milli Məclisin deputatı, professor Şəmsəddin Hacıyev, ADPU-nun rektoru, professor Cəfər Cəfərov ulu öndər Heydər Əliyevin ölkəmizin müstəqilliyi, iqtisadi tərəqqisi və inkişafı istiqamətində gördüyü işlər, Heydər Əliyevin əsasını qoyduğu və möhtərəm Prezidentimiz İlham Əliyev tərəfindən inkişaf etdirilən siyasətin uğurları və gələcək perspektivləri barədə danışıblar. Çıxışçılar qeyd ediblər ki, Azərbaycan son illər möhtəşəm beynəlxalq tədbirlərə yüksək səviyyədə ev sahibliyi edir. Ölkəmiz tolerantlıq və multikulturalizm baxımından bütün dünya üçün layiqli örnəkdir. Ulu Öndərin müdrik siyasi kursu, strateji dövlətçilik xətti müstəqil dövlətimizin bugünkü böyük uğur və nailiyyətlərinin əsas təminatçıdır.

Konfransda ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov "Heydər Əliyev və Azərbaycanda elmi potensialın inkişafı", İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov "Heydər Əliyev və Azərbaycanda milli-pedaqoji fikir tarixinin tədqiqi" mövzularında məruzələrlə çıxışlar ediblər.

Sonra konfransın bölmə iclasında maraqlı məruzə və müzakirələr dinlənilib. Universitetin professor və müəllimləri ümummilli lider Heydər Əliyevin dövlət quruculuğu, iqtisadiyyatın, elm, təhsil və mədəniyyətin, həmçinin idmanın inkişafındakı rolu ilə bağlı maraqlı və məzmunlu çıxışlar ediblər.

Sonda konfrans iştirakçıları adından yekdilliklə bəyanat qəbul olunub, konfransdakı məruzələrin işlənərək kitab şəklində buraxılması qərara alınıb.

**Mənsur İbrahimli**

# Bir qrup professor-müəllim sertifikatla təltif olundu

Bildiyimiz kimi, Azərbaycan Dövlət Pedaqoji Universitetinin qarşıya qoyduğu əsas prioritetllərdən biri professor-müəllim heyətinin peşəkarlığının daha da artırılması, tədris prosesinin təkmilləşdirilməsi məqsədilə lazımi imkanların yaradılmasıdır ki, bu sahədə universitet rəhbərliyi tərəfindən atılan əhəmiyyətli addımlardan biri ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi Fullbright proqramı çərçivəsində Lehigh Universitetinin professoru Jill Sperandionun ADPU-ya dəvət olunması və cari ilin yanvar-may aylarında universitetdə fəaliyyət göstərməsi olmuşdur.

Professor, universitetdə aparılan islahatları dəstəkləmək və planlaşdırmaq məqsədilə tədqiqatlar aparmış, tədris prosesinin modernləşdirilməsində, eyni zamanda yeni yaradılmış şöbələrin fəaliyyətlərinin təşkilinə dəstək göstərmişdir, həmçinin doktorantlar üçün "Tədqiqatın əsasları" mövzusunda təlimlər aparmışdır.

Fəaliyyət göstərdiyi müddətdə universitetin bütün fakültələri üzrə professor-müəllim heyəti üçün "Yeni öyrətmə metodları" mövzusunda silsilə seminarlar təşkil etmiş və iştirakçıların yeni metodlardan istifadə etməklə təqdim etdikləri dərs planını dəyərləndirmişdir.



Mayın 2-də Tədqiqat və inkişaf şöbəsinin təşkilatçılığı ilə müvəffəqiyyət qazanmış müəllimlərə sertifikatların verilməsi mərasimi keçirildi. Tədbirdə universitet rəhbərliyi, ABŞ səfirliyinin mədəniyyət və təhsil məsələləri üzrə müşaviri xanım Heidi Smith və təhsil üzrə mütəxəssis Ramina Mürşüdova, həmçinin professor-müəllim heyəti iştirak etdilər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov Jill Sperandionun ADPU-da fəaliyyəti dövründə gördüyü işlər haqqında qısa məlumat verdi və dəstəyi üçün xanım ekspertə, həmçinin ABŞ səfirliyinə xüsusi təşəkkürünü bildirdi, eyni zamanda bu kimi layihələrin davamlı olacağını iştirakçıların diqqətinə çatdırdı.

Sonra Jill Sperandio universitetdə olduğu 4 ay müddətində ona yaradılan şərait, göstərilən diqqət və qayğıya görə universitet rəhbərliyinə, həmçinin təlimlərdə fəal iştirak edən müəllimlərə ürək sözlərini çatdırdı və gələcək fəaliyyətlərində uğurlar arzuladı.

Daha sonra ABŞ səfirliyinin mədəniyyət və təhsil məsələləri üzrə müşaviri Heidi Smith təlimlərdə fəal iştirak edən müəllim heyətinə ABŞ təhsil proqramları haqqında məlumat verdi və fəaliyyətlərində daha da uğurlu nəticələr əldə etmək üçün bu proqramlar vasitəsilə təcrübələrini artıra bilmə imkanlarından bəhs etdi.

Keçirilən təlimlərin nəticələrinə uyğun olaraq elan olunmuş müsabiqədə iştirakına görə müxtəlif fakültələrin 22 nəfər professor-müəlliminə sertifikatlar təqdim olundu.

İştirakçılardan Tarix və coğrafiya fakültəsinin dekanı Şahin Pənahov bu tip proqramların müəllimlərin peşəkarlıq səviyyəsinin artırılmasında xüsusi rolu olduğunu vurğuladı. Müəllimlərdən Mətanət Əsgərova, Əsmət Teymurova, Səmayə Həsənova, Günay Əfəndiyeva, Şəhla Quliyeva, Rəhimə Məmmədova ürək sözlərini deyərək bu işin təşkilatçılarına təşəkkürlərini bildirdilər və bu kimi təlimlərin davamlı olmasını arzuladılar.

# "Fənlərin tədrisi metodikası: müasir yanaşmalar" mövzusunda Magistrantların I Respublika elmi konfransı

Mayın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş "Fənlərin tədrisi metodikası: müasir yanaşmalar" mövzusunda Magistrantların I Respublika elmi konfransı keçirilib. Qeyd edək ki, konfransın yüksək səviyyədə keçirilməsini təmin etmək məqsədilə ADPU-nun rektoru, professor Cəfər Cəfərovun müvafiq əmri ilə 10 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılıb. Konfransda ADPU-dan və digər unversitetlərdən ümumilikdə 378 nəfər magistrant iştirak edib. Konfransda əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.



Konfransı giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, universitetdə Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi və ulu öndər Heydər Əliyevin 95 illik yubileyi münasibətilə müxtəlif tədbirlər keçirilir. Universitetdə bir-birini tamamlay-



an bu iki böyük tarixi yubiley münasibətilə tədbirlərin davamlı olması nəzərdə tutulur. Rektor qeyd edib ki, inkişaf etmiş dünya ölkələrinin inkişafının kökündə məhz təhsil dayanır. Biz təhsil siyasətimizi müasir dövrün yeni çağırışlarına uyğun qurmalıyıq. Ölkə rəhbərliyinin həyata keçirdiyi təhsil islahatları çərçivəsində pedaqoji kadr hazırlığına xüsusi diqqət yetirilir. Cəmiyyətdə müəllim peşəsinin ictimai nüfuzunun yüksəldilməsi üçün əməli tədbirlər həyata keçirilir. Biliklərə əsaslanan cəmiyyətdə, informasiya cəmiyyətində müəllimin üzərinə düşən məsuliyyət daha da artıb. Hazırda Azərbaycanda pedaqoji kadr hazırlığı ən vacib vəzifələrdən biridir. Bizim bütün fəaliyyətimiz təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət etməlidir. ADPU yaxın gələcəkdə 100 illik yubileyini qeyd edəcəkdir. Biz bu böyük yubileyə yüksək səviyyədə hazırlaşmalıyıq. Magistrantlar öz tədqiqatçılıq qabiliyyətlərini inkişaf etdirməlidirlər. Dünyanın aparıcı xarici dillərinin öyrənilməsi olduqca vacibdir. ADPU yeniləşir, inkişaf edir. Siz bu prosesdə fəal iştirak etməlisiniz. Bugünkü konfrans qarşığımıza qoyduğumuz hədəflərə çatmağımıza müsbət təsir edəcək. Rektor çıxışının sonunda konfransın işinə uğurlar arzulayıb.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək bildirib ki, bu gün ADPU-nun həyatında əlamətdar bir gündür. Sevindirici haldır ki, Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş "Fənlərin tədrisi metodikası: müasir yanaşmalar" mövzusunda Magistrantların I Respublika elmi konfransı ADPU-da keçirilir. Son iki ildə universitetdə bütün sahələrdə, o cümlədən elmi-tədqiqat sahəsində, intellektual potensialın gücləndirilməsi sahəsində mühüm işlər görülür. ADPU-da gənclərin elmi fəaliyyətə daha geniş miqyasda cəlb olunmalarına böyük önəm verilir. Biz ölkəmizin gücləndirilməsi, hərtərəfli inkişaf etməsi üçün, ilk dövbədə, universitetlərimizin fəaliyyətini müasir tələblərə uyğun qurmalıyıq. Hazırda ölkəmizdə universitetlərin tədqiqat universitetlərinə çevrilməsi istiqamətində tədbirlər görülür. ADPU-da da bu vacib istiqamətdə əməli işlər həyata keçirilir.

Professor Zahid Xəlil, dosent İsa İsmayılov çıxış edərək konfransın keçirilməsini yüksək qiymətləndiriblər və magistrantlara uğurlar arzulayıblar.



Konfransda magistrant Aliyə Abdullayeva "Ümumtəhsil məktəblərində biologiyanın tədrisində şagirdlərə tibbi-gigiyenik biliklərin öyrədilməsi məsələləri", magistrant Osman Əhmədzadə "Morfologiyanın tədrisində ədəbi tələffüzlə bağlı aparılan işlər", magistrant Abdulxaliq Məmmədli "Məktəb direktorlarının müzakirə etmək və rəy vermək qabiliyyəti" mövzularında çıxışlar ediblər.

Sonra konfrans öz işini 10 bölmədə-Riyaziyyat və informatika, Fizika, Kimya, Biologiya, Tarix və coğrafiya, Filologiya, Musiqişünaslıq, Pedaqogika- I, Pedaqogika-II və Psixologiya bölmələrində davam etdirib.

2 gün davam edən konfrans mayın 4-də yekunlaşıb. Konfransın sonunda bölmə rəhbərlərinin hesabatları dinlənilib, yekun qərar qəbul edilib.

**Mahirə Mustafayeva**

# Belçikanın ölkəmizdəki səfirliyinin nümayəndələri ilə görüş

Mayın 4-də Belçika Krallığının ölkəmizdəki fövqəladə və səlahiyyətli səfiri cənab Bert Schoofs və köməkçisi Sevil Qəhrəmanova Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) qonağı olublar. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə iştirak ediblər.



Qonaqları salamlayan rektor Cəfər Cəfərov universitetin tarixi, tədris prosesi, tələbə həyatı, qarşıda duran vəzifələr, aparılan islahatlar, təhsilverənlərin fəaliyyətinin təkmilləşdirilməsi və keyfiyyətli nəticələr əldə edilməsi məqsədilə universitetə dəvət olunmuş ekspertlər haqqında məlumat verib.

Görüşdə Belçika ali təhsil müəssisələri ilə əməkdaşlıq imkanları da müzakirə edilib. Peşəkar müəllim yetişdirməyin, eyni zamanda gənc kadrların pedaqoji fəaliyyətə cəlb olunmasının əhəmiyyətindən, eləcə də Belçikadakı ali təhsil müəssisələrindən, təhsil haqlarından bəhs edən cənab səfir göstərilən diqqətə görə təşəkkürünü bildirib.

# Fizika və texnologiya fakültəsində "Açıq qapı günü"

Mayın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində "Açıq qapı günü" keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev və Bakı şəhəri Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin, həmçinin Xırdalan şəhər 2 və 6 nömrəli tam orta məktəblərin müəllim və şagirdləri iştirak ediblər. Fakültənin dekanı, dosent Arzu Daşdəmirov, kafedra müdirləri, dosent Cahangir Hüseynov, dosent Sevinc Cəlilova və Tələbə Elmi Cəmiyyətinin sədri, dosent Xatirə Adıgözəlova qonaqları qarşılayıblar.



Tədbir zamanı müəllim və şagirdlər fakültənin rəhbər şəxsləri ilə birlikdə auditoriyalar və laboratoriyalar ilə tanış olublar. Fakültənin müəllimləri, laborantları tərəfindən qarşılanan şagirdlərə fakültə və kafedralar haqqında məlumat verilib. Laboratoriya otaqlarında şagirdlərə müəllimlər tərəfindən fizikaya aid təcrübələr nümayış etdirilib. Fakültənin tələbələri şagirdlər arasında viktorinalar təşkil ediblər. Qaliblər fakültənin dekanı, dosent A.Daşdəmirov tərəfindən fizikaya aid kitablarla mükafatlandırılıblar. Tədbir şagirdlər tərəfindən maraqla qarşılanıb.

# Ümummilli lider Heydər Əliyevin anadan olmasının 95-ci ildönümünə həsr edilmiş tədbir



Mayın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi Fəxri Xiyabanda xalqımızın ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edib və məzarı önünə əklil qoyub. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri düzülüb. Sonra isə universitetdə Musiqi,təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin müəllim və tələbələrinin iştirakı ilə ulu öndər Heydər Əliyevin anadan olmasının 95-ci ildönümünə həsr edilmiş konsert proqramı keçirilib. Tədbir iştirakçıları öncə fakültənin müəllim və tələbələrinin rəsm əsərləri ilə ta-



nış olublar. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Konsertdə "Xalqa bağışlanan ömür" filmi nümayiş edilib, fakültənin birləşmiş xoru "Gözəl Vətən" musiqili kompozisiyasını təqdim edib. Konsertdə həmçinin Məxfirət Hüseynova, Məhərrəm Alişanov Əməkdar incəsənət xadimi Nailə Mirməmmədlinin iştirakı ilə musiqisi Sevil Əliyevanın, sözləri Baba Vəziroğlunun olan "Ana" mahnısını, Ənvər Məmmədhəsənov musiqisi Kamalın, sözləri Baba Vəziroğlunun olan "Sən elə bir zirvəsən" mahnısını, fakültənin birləşmiş xoru "Bu dünya" musiqili kompozisiyasını, Rauf Məmmədov Müslüm Maqomayevin "Azərbaycan" mahnısını ifa ediblər.

Sonra ulu öndər Heydər Əliyevin ADPU-nun 60 illik yubileyində iştirakını əks etdirən film nümayiş olunub.

Sonda musiqisi Nailə Mirməmmədlinin, sözləri Musiqi və onun tədrisi metodikası kafedrasının baş müəllimi Nərmin Kamilovanın olan "Ulu Öndər" mahnısı ifa edilib.

Konsert proqramı iştirakçılarda xoş təəssürat yaradıb.

**Orxan Abdullayev**

# Anlaşma memorandumu imzalanıb



Mayın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Qazaxıstan Respublikasının Aktau şəhərində fəaliyyət göstərən Ş.Yesenov adına Xəzər Dövlət Texnologiya və Mühəndislik Universitetinin (Yesenov Universiteti) nümayəndələri ilə görüşüb. Görüşdə Ş.Yesenov adına Xəzər Dövlət Texnologiya və Mühəndislik Universitetinin rektoru Berik Axmetov, Elmi işlər və beynəlmiləlləşmə üzrə prorektoru Yermek Nurmaqambet, Tərbiyə və sosial işlər üzrə prorektoru Qulsara Djoldasbayeva , ADPU-nun İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev və Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Lətif Kəngərlinski iştirak ediblər.

Qonaqları salamlayan rektor Cəfər Cəfərov universitetin tarixi, tədris prosesi, tələbə həyatı, qarşıda duran vəzifələr, aparılan islahatlar, təhsilverənlərin fəaliyyətinin təkmilləşdirilməsi və keyfiyyətli nəticələr əldə edilməsi məqsədilə universitetə dəvət olunmuş ekspertlər haqqında məlumat verib. Yesenov Universitetinin rektoru Berik Axmetov göstərilən diqqətə görə təşəkkürünü bildirib. O, rəhbərlik etdiyi universitetin tarixindən və bugünkü fəaliyyətindən söz açaraq universitetlərində Azərbaycan mədəniyyəti və tarixi mərkəzinin fəaliyyəti haqqında məlumat verib.

Görüşdə iki universitet arasında əməkdaşlıq imkanları müzakirə edilib, anlaşma memorandumu imzalanıb və xatirə şəkli çəkdirilib.

# TGT-nin VIII hesabat konfransı

Mayın 11-də Azərbaycan Dövlət Pedaqoji Universiteinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) VIII hesabat konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, Gənclər və İdman Nazirliyinin, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) nümayəndələri iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.




Konfransı giriş sözü ilə açan aparıcı Fidan Bağırova hesabat məruzəsi ilə çıxış etmək üçün sözü TGT-nin sədri Taleh Budaqova verib. Taleh Budaqov təşkilatın 2017-2018-ci illər üzrə fəaliyyəti haqqında hesabat məruzəsi ilə çıxış edib. Bildirib ki, TGT-nin 4 mindən çox üzvü var. TGT il ərzində 200 yaxın tədbir keçirib. T.Budaqov hesabat məruzəsində TGT-nin gördüyü işlər, həyata keçirdiyi çoxsaylı layihələr, ictimai-mədəni tədbirlər, humanitar aksiyalar, qazandığı uğurlar barədə ətraflı məlumat verib. Məruzəçinin çıxışında tələbə-gənclərin intellekt səviyyəsinin yüksəldilməsi, dünyagörüşlərinin genişləndirilməsi, onların vətənpərvər, adət-ənənələrimizə, milli-mənəvi dəyərlərimizə, dövlət və dövlətçiliyə sədaqət ruhunda tərbiyə olunmaları, həmçinin asudə vaxtlarının səmərəli təşkili üçün həyata keçirilən tədbirlər konkret faktlar və rəqəmlər əsasında öz əksini tapıb. T.Budaqov təşkilata göstərdiyi diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Rektor Cəfər Cəfərov çıxış edərək bildirib ki, mayın 10-da müasir Azərbaycanın qurucusu, ulu öndərimiz Heydər Əliyevin anadan olmasının 95-ci ildönümü tamam oldu. Bu münasibətlə ADPU-da müxtəlif tədbirlər keçirilib. Qarşıdan Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi gəlir. 100 il bundan öncə xalqımızın say-seçmə, vətənpərvər oğulları Azərbaycan Xalq Cümhuriyyətini yaratdılar. Lakin çox əfsuslar olsun ki, Azərbaycan Xalq Cümhuriyyəti cəmisi 23 ay yaşadı. Azərbaycan uzun müddət Sovetlər Birliyinin tərkibində yaşamalı oldu. Xalqımız 1991-ci ildə yenidən öz dövlət müstəqilliyini bərpa etdi. Ümummilli lider Heydər Əliyev Azərbaycanın dövlət müstəqilliyini qorudu, gücləndirdi, ölkəmizi inkişaf etdirdi və dünya birliyinin layiqli üzvü olmasını təmin etdi. Ulu Öndər müəllim peşəsinə böyük qiymət verərək demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Son illər ölkə rəhbərliyi cəmiyyətdə müəllim peşəsinin ictimai nüfuzunun yüksəldilməsi, pedaqoji kadr hazırlığının gücləndirilməsi üçün mühüm tədbirlər həyata keçirir. ADPU 17 mindən cox tələbəsi, 5 filialı və ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci ilə birlikdə ölkəmizin ən böyük ali təhsil müəssisələrindən biridir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin qarşıya qoyduğu yeni vəzifələri uğurla həyata keçirmək üçün ölkəmizin intellektual potensialı gücləndirilməlidir. Müasir dövrdə keyfiyyətli təhsil almaq olduqca vacibdir. Tələbələr bilik və bacarıqlara dərindən yiyələnməli, əsl vətəndaş kimi formalaşmalıdırlar. TGT qarşımıza qoyduğumuz böyük hədəflərə çatmaq üçün bizimlə birgə əzmlə çalışmalıdır. Rektor çıxışının sonunda TGT-yə uğurlar arzulayıb.

Konfransda çıxış edən Gənclər və İdman Nazirliyinin sektor müdiri Elşən Hüseynov, ATGTİ-nin İctimaiyyətlə əlaqələr departamentinin direktoru Cavid Hüseynov TGT-nin fəaliyyətini yüksək qiymətləndiriblər və təşkilata uğurlar arzulayıblar.



Konfransda təhsildə fərqlənən və universitetin ictimai-mədəni həyatında fəal iştirak edən tələbələr, həmçinin TGT-nin fəaliyyətinə dəstək verən fakültə dekanları mükafatlandırılıblar.

Konfransda TGT-nin sədri, sədr müavinləri, departament və klub rəhbərləri seçilib. Taleh Budaqov yenidən TGT-nin sədri seçilib.

# Böyük hind ədibi və mütəfəkkiri Rabindranat Taqorun həyat və yaradıcılığına həsr olunmuş tədbir

Mayın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun "Dünya elmi Azərbaycanda" layihəsi çərçivəsində böyük hind ədibi və mütəfəkkiri, Nobel mükafatı laureatı Rabindranat Taqorun həyat və yaradıcılığına həsr olunmuş tədbir keçirilib. Tədbirdə Hindistan Respublikasının ölkəmizdəki fövqəladə və səlahiyyətli səfiri Sanjay Rana, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun Aparat rəhbəri, professor İsaxan Vəliyev və həmin Fondun Lektorlar qrupunun üzvü, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Nizami adına Ədəbiyyat İnstitutunun Azərbaycan-Asiya ədəbi əlaqələri şöbəsinin müdiri, professor Bədirxan Əhmədov, universitetin müəllim və tələbələri iştirak ediblər.




Tədbiri giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, dünya şöhrətli sənət adamlarının yaradıcılıqlarının təbliği və təşviqi istiqamətində görülən işlər gənclərin dünyagörüşünün formalaşmasına müsbət təsir edir. Rektor tədbirin keçirilməsini yüksək qiymətləndirib və bu işdə əməyi keçən hər kəsə təşəkkür edib.

Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun Aparat rəhbəri, professor İsaxan Vəliyev çıxış edərək bildirib ki, Rabindranat Taqor haqqında həm onun müasirləri, həm də ondan sonra yaşamış bir sıra mütəfəkkirlər, ictimai-siyasi xadimlər müxtəlif fikirlər söyləyiblər. Lakin 1998-ci ildə "Rifah iqtisadiyyatı mövzusundakı əlavələrinə görə" iqtisadiyyat üzrə Nobel mükafatına layiq görülmüş Amartiya Senin Rabindranat Taqorun şəxsiyyətinə və yaradıcılığına yanaşma tərzi diqqəti daha çox cəlb edir. Rabindranat Taqoru Benqaliyanın "qızıl səsi" adlandıran müəllif qeyd edir ki, mədəniyyətlərin toqquşması məsələsinə öz əsərlərində xüsusi yer ayıran Taqorun fikirləri ona görə inandırıcı görünürdü ki, o bir-biri ilə ciddi rəqabətdə olan müsəlman, xristian və Şərq sivilizasiyalarının təsiri altında formalaşmış üç mədəniyyətin qovuşğunda-indus, müsəlman və ingilis mədəniyyətli benqal ailəsində böyümüşdü.

Sonra Rabindranat Taqorun həyat və fəaliyyətindən bəhs edən film nümayiş etdirilib.

Filmin nümayişindən sonra çıxış edən Hindistanın ölkəmizdəki fövqəladə və səlahiyyətli səfiri Sanjay Rana tədbirin mahiyyəti haqqında öz fikirlərini bölüşüb və tədbirin təşkilatçılarına minnətdarlığını ifadə edib.

Rəsmi hissəyə professor Bədirxan Əhmədovun geniş məruzəsi ilə yekun vurulub.

Tədbirdə Azərbaycan Dillər Universitetinin Hind dili və mədəniyyəti mərkəzinin kollektivinin ifasında Rabindranat Taqorun müəllifi olduğu şeirlər və mahnılar səsləndirilib.

Sonda hədiyyələr təqdim edilib və xatirə şəkli çəkdirilib.

**Nurlan Səmədov**

# Elmi Şuranın iclası

**Mayın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə 2017-2018-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasına hazırlıq barədə, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin fəaliyyəti haqqında və cari məsələlər daxildir.**

Rektor Cəfər Cəfərov çıxışında Elmi Şura üzvlərini Azərbaycan Xalq Cümhurriyyətinin qarşıdan gələn 100 illik yubileyi və müqəddəs Ramazan ayının başlanması münasibətilə təbrik edib və uğurlar arzulayıb. Qeyd edib ki, bizim əsas məqsədimiz, başlıca hədəfimiz təhsilin keyfiyyətinin yüksəldilməsi, pedaqoji kadr hazırlığında liderliyi ələ almaqdır. Bu məqsədlə universitetdə islahatlar, yeni layihələr həyata keçirilir, professor-müəllim heyətinin bilik və peşəkarlıq səviyyəsinin artırılması, onların fəaliyyətinin təkmilləşdirilməsi üçün təcrübəli və nüfuzlu mütəxəssislər cəlb edilir, müxtəlif kurslar, təlimlər və digər tədbirlər gerçəkləşdirilir. Biz stereotipləri qırmalı, təşəbbüskar, yenilikçi, müasir olmalı və ölkəmizin inkişafına öz töhfələrimizi verməliyik.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov 2017-2018-ci tədris ilinin yaz semestrinin imtahan sessiyası barədə çıxış edib. Dosent E.Aslanov bildirib ki, imtahan sessiyası 1iyun-30 iyun 2018-ci il tarixində tərtib olunmuş cədvəl üzrə keçiriləcəkdir. Ümumilikdə ADPU-da 17270 nəfər tələbə təhsil alır. 1243 nəfər professor-müəllim və 1124 nəfər inzibati heyət olmaqla cəmi 2367 nəfər çalışır. Yaz semestrinin imtahan sessiyası və dövlət imtahanları Tədris Departamentinin İmtahan və monitorinq şöbəsi tərəfindən həyata keçiriləcək və vahid mərkəzdən idarə olunacaqdır. Semestr və dövlət imtahanlarında mütəşəkkilliyin təmin olunması məqsədilə mərkəzin ümumi təşkilatçılığı və koordinatorluğu ilə 30 nəfər imtahan təşkilatçısı, o cümlədən 90 nəfər nəzarətçi əməkdaşdan ibarət İmtahan İdarəetmə Qrupu yaradılacaq. İmtahanların təşkili və imtahanlarla əlaqəli bütün funksiyaların icrası bu qrupa həvalə ediləcəkdir. Tələbələrin ədəbiyyatla təmin olunmasına, apelyasiya prosesində müəllimlərin davranışına, tələbələrin əlavə məsləhət saatlarına diqqət yetirilməlidir. İyunun 20-dən iyulun 5-dək isə Yekun Dövlət Attestasiyası təşkil olunacaq. İmtahan tələbənin qərarına əsasən test üsulu ilə və ya yazılı formada keçiriləcək. Kitabxana-İnformasiya Mərkəzi gücləndirilmiş iş rejimində çalışacaq. İmtahan sessiyası müddətində tələbələrin valideynlərinin, ictimaiyyət nümayəndələrinin, media təmsilçilərinin imtahanların gedişini izləmələri üçün lazımi şərait yaradılacaq. Yaz semestrinin imtahan sessiyası və dövlət imtahanları ədalətli, şəffaf və obyektiv keçiriləcək.



Elmi Şura dosent E.Aslanovun hesabatını qəbul edib.

Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin fəaliyyəti haqqında fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva çıxış edib. Dekan Ş.Əliyeva bildirib ki, fakültə öz fəaliyyətində Təhsil Nazirliyinin və rektorluğun əmr və sərəncamlarının əsas götürüb və onların icrasına nəzarət edib. Hazırda fakültənin əyani şöbəsində 3 ixtisas - "Məktəbəqədər təlim və tərbiyə", "Təhsildə sosial-psixoloji xidmət", "Korreksiyaedici təlim", qiyabi şöbədə isə bir ixtisas -"Məktəbəqədər təlim və tərbiyə" ixtisasları üzrə kadr hazırlanır. Həmin ixtisaslara dair baza proqramları, dövlət standartları və tədris planları fakültədə hazırlanıb. Fakültədə 1406 nəfər tələbə təhsil alır. 4 kafedra: Məktəbəqədər təlimin pedaqogikası və metodikası kafedrası, Yaş və pedaqoji psixologiya kafedrası, Korreksiyaedici təlim kafedrası, Ümumi psixologiya kafedrası fəaliyyət göstərir. Fakültədə 4 nəfər elmlər doktoru, 3 nəfər professor, 29 nəfər fəlsəfə doktoru, 16 nəfər dosent, 29 nəfər müəllim çalışır. Professor-müəllimlər çoxlu sayda dərslik və vəsaiti hazırlayaraq tələbələrin istifadəsinə veriblər. Tədris prosesi mövcud qaydalara uyğun qurulub. Tələbələrin davamiyyətinə ciddi nəzarət edilir. Tələbələr pedaqoji təcrübədə fəal iştirak edirlər. Fakültədə Tələbə Elmi Cəmiyyəti, Tələbə Gənclər Təşkilatı, Tələbə Həmkarlar Təşkilatı, tələbə elmi dərnəkləri fəaliyyət göstərir. Fakültədə müntəzəm olaraq elmi konfranslar, seminarlar, təlimlər və mədəni-kütləvi tədbirlər keçirilir. Eyni zamanda, fakültənin müəllimləri müxtəlif elmi tədbirlərdə iştirak edirlər. Tələbələr universitetin və ölkəmizin ictimai-mədəni həyatında yaxından iştirak edirlər. Məqsədimiz tələbələrin bilik və bacarıqlara dərindən yiyələnmələri, onların yüksək səviyyəli mütəxəssis və əsl vətəndaş kimi formalaşmasıdır.

Dekan Ş.Əliyevanın çıxışında fakültədə mövcud olan ixtisaslar üzrə payız və yaz imtahan sessiyalarında qazanılmış müvəffəqiyyət və keyfiyyət göstəriciləri geniş təhlil edilib. Bu təhlil sayəsində Elmi Şura üzvləri tələbələrin tədrisi mənimsəmələri haqqında səhih məlumat əldə ediblər.

Elmi Şura pedaqogika üzrə elmlər doktoru Ş.Əliyevanın hesabatını qəbul edib.

İclasda Tədris Departamentinin direktor müavini, dosent Ənvər İmanov Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində aparılan monitorinqin nəticələri barədə məlumat verib.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov elmlər doktoru və fəlsəfə doktoru proqramları üzrə elmi rəhbərlər və elmi məsləhətçilərlə bağlı çıxış edib və müvafiq qərarlar qəbul olunub.

Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev Pedaqoji Təcrübə Komissiyasının qərarlarını Elmi Şura üzvlərinin diqqətinə çatdırıb. Qeyd edib ki, Pedaqoji Təcrübə Komissiyasının qərarına əsasən yenidənhazırlanma təhsilində pedaqoji təcrübənin müddəti 2 həftə, qiyabi təhsilalma forması üzrə isə 14 həftə müəyyən edilib.

Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə, professor Buludxan Xəlilov, professor Zahid Xəlil, professor Himalay Qasımov, professor Malik Cəbrayılov, professor Fərrux Rüstəmov, professor İramin İsayev, dosent Arzu Daşdəmirov, dosent Şahin Pənahov, dosent Laçın Həsənova və başqaları çıxış edərək imtahan sessiyasının təşkili və təhsilin keyfiyyətinin yaxşılaşdırılması ilə bağlı öz fikir və təkliflərini bildiriblər.

İclasda dosent attestatları, fəlsəfə doktoru diplomları təqdim edilib.

Sonda Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov cari məsələlər barədə məlumat verib. Cari məsələlər müzakirə edilib və müvafiq qərarlar qəbul olunub.

**Mənsur Qüdrətoğlu**

# Professor Yaqub İbn Əl-Şaruni ilə görüş



Mayın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) misirli professor Yaqub İbn Əl-Şaruni ilə görüş keçirilib. Görüşdə ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev,Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Azərbaycan Respublikası Mədəniyyət Nazirliyinin Firudin bəy Köçərli adına Respublika Uşaq Kitabxanasının direktoru Şəhla Qəmbərova, Misir Mədəniyyət Mərkəzinin müdiri Ahmed Sami Elaydi, Filologiya fakültəsinin müəllim və tələbələri, Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşları iştirak ediblər.

ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev görüşü giriş sözü ilə açaraq professor Yaqub Əl Şaruninin həyat və yaradıcılığı haqqında məlumat verib. Qeyd edib ki, professor Yaqub Əl Şaruni Misirin uşaq ədəbiyyatı üzrə böyük alimi, ədəbiyyatşünas, uşaq ədəbiyyatı üzrə bir çox beynəlxalq müsabiqələrin laureatıdır. O, uşaq ədəbiyyatı üzrə 400-dən çox kitabın müəllifidir.

Misir Mədəniyyət Mərkəzinin müdiri Ahmed Sami çıxış edərək bildirib ki, Misir ilə Azərbaycan arasında əlaqələr yüksək səviyyədədir və bu əlaqələr daha da inkişaf edir. Firudin bəy Köçərli adına Respublika Uşaq Kitabxanası kitab mədəniyyətinin təbliği, dünya uşaq ədəbiyyatı nümunələrinin geniş oxucu kütləsinə daha aydın şəkildə çatdırılması və bu ədəbiyyata maraq yaradılması məqsədilə bir çox dövlətlərin uşaq ədəbiyyatı həftələrinin təşkilinə nail olub və onları yüksək səviyyədə təqdim edib. 14-18 may 2018-ci il tarixində Firudin bəy Köçərli adına Respublika Uşaq Kitabxanası Misir Mədəniyyət Mərkəzinin köməyi ilə Misir Uşaq Ədəbiyyatı həftəsi keçirir. ADPU-da professor Yaqub Əl Şaruni ilə keçirilən görüş də bu layihə əsasında gerçəkləşib.

Professor Yaqub İbn Əl-Şaruni çıxışında tələbələrlə görüşməkdən və onlarla uşaq ədəbiyyatı barədə danışmaqdan, fikir mübadiləsi aparmaqdan məmnunluq duyduğunu bildirib. Vurğulayıb ki, Misir-Azərbaycan ədəbi əlaqələrinin yaranması uşaq ədəbiyyatının tərcümə edilməsi ilə başlayıb. Tərcümə xalqların bir-birinə yaxınlaşmasında mühüm rol oynayır. Tərcümə vasitəsilə xalqlar bir-birinin tarixini, ədəbiyyatını, mədəniyyətini, həyat tərzini, iqtisadi vəziyyətini öyrənə bilirlər. Uşaq ədəbiyyatında uşaqların daxili dünyası, düşüncələri, arzuları, onların şəxsiyyət kimi formalaşmasına təsir göstərən amillər öz əksini tapır. Professor Yaqub Əl Şaruni maraqlı və məzmunlu çıxışında Misirdə uşaq ədəbiyyatının yaranması, inkişafı, bugünkü vəziyyəti və bu sahədə yazıb-yaradan ədiblər, şairlər, alimlər haqqında ətraflı məlumat verib.

Firudin bəy Köçərli adına Respublika Uşaq Kitabxanasının direktoru Şəhla Qəmbərova çıxış edərək görüşün keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və belə tədbirlərin tələbələrin biliklərinin artmasına, dünyagörüşünün formalaşmasına, onların daxili mənəvi aləmlərinin zənginləşməsinə səmərəli təsir etdiyini vurğulayıb.

Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zahid Xəlil çıxış edərək görüşün keçirilməsini yüksək qiymətləndiriblər və uşaq ədəbiyyatı ilə bağlı fikirlərini bölüşüblər.

Görüş diskussiya şəraitində keçib, tələbəgənclərin sualları cavablandırılıb.

**Orxan Abdullayev**

# "Mir Cəlal - yazıçı, alim və müəllim" Respublika Elmi Konfransı



Mayın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) görkəmli yazıçı və ədəbiyyatşünas alim Mir Cəlal Paşayevin anadan olmasının 110 illiyinə həsr olunmuş "Mir Cəlal - yazıçı, alim və müəllim" Respublika Elmi Konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, ölkəmizin tanınmış və nüfuzlu alimləri, ziyalıları, Filologiya fakültəsinin müəllim və tələbələri iştirak ediblər. Konfrans iştirakçıları öncə professor Mir Cəlal Paşayevin əsərləri ilə tanış olublar.

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bu günlər respublikamızda professor Mir Cəlal Paşayevin anadan olmasının 110 illiyinə həsr olunmuş müxtəlif silsilə tədbirlər həyata keçirilir. ADPU-da keçirilən bugünkü konfrans da həmin silsilə tədbirlər çərçivəsində keçirilən bir tədbirdir. Bu gün universitetin həyatında əlamətdar bir gündür. Bu böyük şəxsiyyətin işığına xalqımızın görkəmli alimləri, ziyalıları toplaşıblar. Mir Cəlal Paşayev böyük alim, örnək pedaqoq, tanınmış yazıçı olub. Onun yaradıcılığında insan və zaman haqqında düşüncələr xüsusi yer tutur. Rektor çıxışının sonunda konfransın ərsəyə gəlməsində əməyi keçən hər kəsə təşəkkür edib və konfransın işinə uğurlar arzulayıb.

Konfransda Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, professor Təhsin Mütəllibov"Mir Cəlal xatirələrdə" mövzusunda məruzə ilə çıxış edib. Professor T.Mütəllibov qeyd edib ki, nəcib və xeyirxah insanların əməlləri onların özlərindən sonra da yaşayır. Bugünkü konfrans bunu bir daha təsdiqləyir. Xatirələr insanın ikinci ömrüdür. Bu baxımdan, professor Mir Cəlal Paşayev zəngin, mənalı, şərəfli bir müəllim-alim-yazıçı ömürü yaşayıb. Müəllimlik onun fəaliyyətində aparıcı yer tuturdu. Müəllim öz ləyaqəti, mədəniyyəti, yüksək mənəvi-əxlaqi keyfiyyətləri ilə əsl şəxsiyyət olmalıdır. Professor Mir Cəlal Paşayev əsl şəxsiyyət idi. Səbirli, müdrik, alicənab, həssas, sadə və səmimi bir insan olan professor Mir Cəlal Paşayev həmişə tələbələrin mövqeyindən çıxış edər, onların qayğısına qalardı. O, səmərəli elmi-pedaqoji fəaliyyət göstərib. Professor Mir Cəlal Paşayevin xatirəsi həmişə bizim üçün əzizdir.

Professor Buludxan Xəlilov "Yazıçı-alimin və müəllimin manifesti" mövzusunda məruzə ilə çıxış edib. Professor B.Xəlilov bildirib ki, professor Mir Cəlal Paşayev müəllim, alim və yazıçı kimi cəmiyyətə layiqli bir nümunə olub. Professor Mir Cəlal Paşayev Məhəmməd Füzulini böyük lirik şair kimi təqdim etməyi bacarıb, ədəbi məktəblərin tədqiqində bir ardıcıllıq yaradıb. Onun sadə, səlis dili, özünəməxsus yaradıcılıq üslubu, insanlara və hadisələrə aydın yanaşma tərzi olub. Dil, Vətən, ana, klassiklərlə müasirlərin varisliyi, vəhdəti məsələlərini gündəmə gətirib. "Bir gəncin manifesti" romanı yazıçının yaradıcılığında xüsusi yer tutur. Bütövlükdə professor Mir Cəlal Paşayev ədəbiyyatşünaslığın inkişafında mühüm xidmətlər göstərib.

Konfransda professor Asəf Zamanov, professor Qəzənfər Paşayev, professor Şirindil Alışanlı, professor Cəlil Nağıyev, professor Təyyar Cavadov, professor Abdulla Abasov, dosent Məti Osmanoğlu, yazıçı Elçin Hüseynbəyli çıxış edərək professor Mir Cəlal Paşayevi XX əsr Azərbaycan ədəbiyyatşünaslıq elminin görkəmli nümayəndələrindən biri kimi səciyyələndiriblər və onun roman yaradıcılığını yüksək qiymətləndiriblər.

**Könül Nəzərova**

# SABAH qruplarına qəbulla bağlı I tədris ilinin tələbələri ilə görüş

**Mayın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2018-2019-cu tədris ili üçün Təhsil Nazirliyinin SABAH qruplarına qəbulla bağlı I tədris ilinin tələbələri ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, SABAH qruplarının İcra Komitəsinin tələbələrlə iş üzrə meneceri Mehriban Rəsulova, universitet üzrə SABAH qruplarının koordinator rəhbəri Lalə Mürsəlbəyova və fakültə dekanları iştirak ediblər.**

Tədbiri giriş sözü ilə açan Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov bildirib ki, bugünkü görüşdə tələbələrə SABAH qruplarına tələbə seçimi qaydaları barədə məlumat veriləcək. SABAH qrupları ölkə rəhbərliyinin gənclərə yüksək səviyyədə təhsil almaq üçün yaratdığı əlverişli imkandır. ADPU-nun rəhbərliyi tələbələrin yüksəkixtisaslı mütəxəssis kimi yetişmələri üçün əzmlə fəaliyyət göstərir. ADPU-da 3 ixtisas üzrə-"Riyaziyyat və informatika müəllimliyi", "İbtidai sinif müəllimliyi" və "Məktəqədər təlim-tərbiyə" ixtisasları üzrə 117 nəfər tələbə təhsil alır.

SABAH qruplarının İcra Komitəsinin tələbələrlə iş üzrə meneceri Mehriban Rəsulova çıxış edərək SABAH qruplarına qəbul şərtləri və bu qrupların üstünlükləri barədə məlumat verib. Qeyd edib ki, 2014-2015-ci tədris ilindən fəaliyyət göstərən SABAH qrupları ali təhsildə tədrisin keyfiyyətinin yüksəldilməsi, yeni və fərqli mühitin yaradılması, savadlı, bacarıqlı və hazırlıqlı tələbələrin yetişdirilməsi, əmək bazarının artan tələblərinə müvafiq olaraq kadr hazırlığının təmin edilməsi məqsədi ilə yaradılıb. SABAH qrupları tələbələrə əlavə təqaüd, bölgələrdə qeydiyyatda olan tələbələr üçün ödənişsiz yataqxana xidməti, xarici mübadilə proqramları, müasir təşkilat və müəssisələrdə tədris və istehsalat təcrübələri, əmək bazarında daha uğurlu namizədlərə çevrilmə kimi üstün imkanlar təklif edir. SABAH qrupları həmçinin tələbələrin şəxsiyyət olaraq hərtərəfli formalaşmaları üçün tədrisdənkənar imkanlar da yaradır.





2017-2018-ci tədris ilindən SABAH qruplarına tələbələrin seçimi www.student.sabah.edu.az portalı və www.sabah.edu.az portalı vasitəsilə tam elektron qaydada aparılır. Portal namizədlərin elektron ərizələrinin yoxlanılması və nəticəsi haqqında bildiriş göndərilməsi, müsabiqənin bütün mərhələləri üzrə nəticələrin emal olunması və yekun qeydiyyatın onlayn aparılmasını təmin edir.

2018-2019-cu tədris ili üçün SABAH qruplarına ümumilikdə 30 ixtisas üzrə tələbə seçimi müsabiqəsi aparılacaq. Müsabiqədə Təhsil Nazirliyinin tabeliyində olan ali təhsil müəssisələrindən müəyyən edilmiş ixtisaslar üzrə I tədris ilində əyani formada təhsil alan, həmin tədris ilinin I semestrinin nəticələrinə görə akademik borcu olmayan və orta müvəffəqiyyət göstəricisi (ÜOMG) 61-dən aşağı olmayan Azərbaycan Respublikası vətəndaşları iştirak edə bilərlər. Müsabiqənin 1-ci mərhələsində iştirak etmək üçün namizədlər 23 may 2018-ci il tarixinədək www.sabah.edu.az .saytına və www.sabah.edu.az portalına daxil olmaqla elektron ərizəni doldurmalıdırlar. Elektron ərizələrin qəbulu başa çatdıqdan sonra ərizəsi təsdiqlənmiş namizədlər müsabiqənin II mərhələsində-test imtahanında iştirak edəcəklər.

Qeyd edək ki, hazırda SABAH qrupları 12 ali təhsil müəssisəsində fəaliyyət göstərməklə 45 ixtisas üzrə 2300-dən çox tələbəni, 650-dən çox professor-müəllim heyətini əhatə edir. 2016-2017-ci tədris ilində SABAH qruplarının ilk məzunlarının sayı 722 nəfər olub.

Görüşdə SABAH qrupları ilə bağlı videoçarx təqdim edilib.

Tələbələrin fəallığı şəraitində keçən görüşdə onların çoxsaylı sualları cavablandırılıb.

**Mahirə Məhərrəmqızı**

# "Beynəlxalq elmi jurnalların tələbləri və elmi məqalələrin yazılma qaydaları: Gənc alim və tədqiqatçılara dəstək" adlı layihə çərçivəsində təlim

**Mayın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Clarivate Analytics Şirkətinin həyata keçirdiyi "Beynəlxalq elmi jurnalların tələbləri və elmi məqalələrin yazılma qaydaları: Gənc alim və tədqiqatçılara dəstək" adlı layihə çərçivəsində təlim keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müvafiq şöbələrin əməkdaşları iştirak ediblər.**



ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, universitetdə yaxın günlərdə professor-müəllim heyətinin fəaliyyətinin qiymətləndirilməsi ilə bağlı müzakirə aparılacaq. Nüfuzlu beynəlxalq elmi jurnallarda məqalələrin dərc olunması professor-müəllim heyətinin fəaliyyətinin qiymətləndirilməsində əhəmiyyətli rol oynayır. Bugünkü təlim də bu mövzuya həsr olunub.

Rektor qeyd edib ki, Clarivate Analytics Şirkəti Azərbaycanın gənc alim və tədqiqatçıları arasında maarifləndirmə işlərini aparmaq, onların bu sahədə məqsədlərinə nail olmaları üçün silsilə tədbirlərdən ibarət "Beynəlxalq elmi jurnalların tələbləri və elmi məqalələrin yazılma qaydaları: Gənc alim və tədqiqatçılara dəstək" adlı layihə həyata keçirir. Layihənin əsas məqsədi mühüm elmi-tədqiqat nəticələrinin əldə olunmasında və təbliğində böyük imkanlara malik olan beynəlxalq elmi bazaların imkanlarından istifadə metodları, yüksək indeksli beynəlxalq jurnallarda məqalələr üçün qoyulan tələblər, müasir beynəlxalq jurnalların idarəedilmə prinsipləri və digər mövzularla bağlı gənc alim və tədqiqatçıları maarifləndirməkdir.

Qeyd edək ki, təlim iki hissədən ibarət olub. Təlimin birinci hissəsində Clarivate Analytics Şirkətinin Azərbaycan üzrə nümayəndəsi Aygün Babazadə təmsil etdiyi qurumda yer alan elmi jurnallar haqqında, agentliyin təqdim etdiyi "Web of Science" platforması və onunla əlaqəli resurslarla iş üzrə istiqamətlərin verilməsi, platformada axtarışın səmərəli aparılması, ən nüfuzlu jurnalların və yüksək istinadlı məqalələrin axtarıb tapılması, platformada qeydiyyatdan keçmək və sair məsələlərlə bağlı ətraflı məlumat verib. Bildirib ki, bu jurnalların təsir gücü onlara edilən istinadların sayı ilə müəyyən edilir. Nüfuzlu beynəlxalq elmi jurnallarda dərc olunan məqalələrin ümumi sayına görə Azərbaycan Cənubi Qafqazda 2-ci yerdə dayanır. 2016-cı illə müqayisədə ADPU-nun professor-müəllimlərinin nüfuzlu beynəlxalq elmi jurnallarda dərc olunan məqalələrinin ümumi sayı 3 dəfə artıb.

Təlimin ikinci hissəsində isə Xəzər Universitetinin "Xəzər Humanitar və Sosial Elmlər" beynəlxalq elmi jurnalının redaktor müavini Xəyalə Məmmədova elmi jurnalın idarə edilməsi prinsipləri, "Web of Science" platformasına daxil olmaq üçün jurnallar, eyni zamanda, çap olunacaq məqalələr qarşısında qoyulmuş tələblər, elmi məqalələrin təqdimetmə qaydaları, seçim meyarları və digər praktiki məsələlərlə bağlı layihə iştirakçılarını geniş məlumatlandırıb.

Təlimdə mövzu ilə bağlı maraqlı fikir mübadiləsi aparılıb, iştirakçıların sualları cavablandırılıb.

Təlimin sonunda Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov maraqlı və məzmunlu təqdimatlara görə təşəkkür edib.

# Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 illiyinə həsr olunmuş tədbir

**Mayın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 illiyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müəllimlər və tələbələr, Türkiyə Respublikasının Azərbaycandakı səfirliyinin nümayəndələri, yazıçılar, ziyalılar, mədəniyyət və incəsənət xadimləri iştirak ediblər. Tədbirdən öncə iştirakçılar Azərbaycan Xalq Cümhuriyyətinə həsr olunmuş əsərlərlə tanış olublar.**



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, xalqımız böyük tarixi hadisə ərəfəsindədir. Xalqımız hər il 28 May-Respublika Gününü qeyd edir. Bu il isə Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 il tamam olur. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2017-ci il may ayının 16-da Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi haqqında Sərəncam imzalayıb. Həmçinin dövlət başçımız 2018-ci il yanvar ayının 10-da 2018-ci ilin Azərbaycan Respublikasında "Azərbaycan Xalq Cümhuriyyəti İli" elan edilməsi haqqında Sərəncam imzalayıb. Azərbaycan Xalq Cümhuriyyəti yalnız xalqımızın deyil, eləcə də bütün Türk dünyasının milli qürur mənbəyidir. Müasir Azərbaycanın qurucusu, ulu öndər Heydər Əliyev demişdir: "Azərbaycan Xalq Cümhuriyyəti az yaşasa da, xalqımızın azadlıq, müstəqillik fikirlərini daha da gücləndirmiş oldu". Azərbaycan Xalq Cümhuriyyəti müsəlman Şərqində ilk parlament tipli respublikadır. Azərbaycan Xalq Cümhuriyyəti dünyada ilk dəfə qadınlara seçib-seçilmək hüququ verib. ADPU-da Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi münasibətilə müxtəlif tədbirlər keçirilir və bu tədbirlərin davamlı olması nəzərdə tutulur. Cümhuriyyət liderlərinin həyat və fəaliyyəti dərindən öyrənilməli, Cümhuriyyət dəyərləri geniş təbliğ edilməlidir.

Türkiyə Respublikasının Azərbaycandakı səfirliyinin mədəniyyət və tanıtma müşaviri, araşdırmaçı, yazıçı İrfan Çiftçi çıxış edərək bildirib ki, ulu öndər Heydər Əliyev "Biz bir millət, iki dövlətik" deyib. Yüz il bundan öncə Azərbaycan xalqının vətənpərvər ruhlu, müasir, mütərəqqi və demokratik düşüncəli övladları Azərbaycan Xalq Cümhuriyyətini yaratdılar. Azərbaycan Xalq Cümhuriyyətinin Türk dünyasının ictimai-siyasi fikir və dövlətçiliyi tarixində xüsusi şərəfli yeri və mövqeyi var. Hazırda Türkiyə-Azərbaycan münasibətləri yüksək səviyyədə inkişaf edir.



Məhəmməd Əmin Rəsulzadə irsinin tədqiqatçısı, yazıçı-publisist Nəcibə Bağırzadə çıxışında xalqımızın bu böyük oğlunun həyat və fəaliyyəti, apardığı siyasi mübarizə haqqında ətraflı məlumat verib. Qeyd edib ki, M.Ə.Rəsulzadə gənclik illərindən xalqımızın azadlığı uğrunda mübarizəyə başlayıb. Zəngin biliyə, geniş dünyagörüşünə malik olan M.Ə.Rəsulzadə Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasında əvəzsiz xidmətlər göstərib. Cümhuriyyət dövründə Azərbaycan dili dövlət dili elan edildi, üçrəngli bayrağımız dövlət bayrağı kimi qəbul edildi. Azərbaycan Xalq Cümhuriyyətinin liderlərinin xatirəsi bizim üçün həmişə əzizdir.

Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, şair, esseist, tərcüməçi Səlim Babullaoğlu çıxış edərək Azərbaycan Xalq Cümhuriyyətinin fəaliyyəti ilə bağlı fikir və mülahizələrini bölüşüblər.

Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin dekanı, dosent Laçın Həsənova tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rektoru, professor Cəfər Cəfərova təşəkkür edib.

Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin II tədris ilinin tələbələri Aslan Muradoğlu, Elşən Abbaszadə, Əhməd Almuradov sazda "Naxçıvanı", "Urfani" mahnılarını ifa ediblər. Fakültənin III tədris ilinin tələbələri Leyla Həsənli, Etibar İsmayılov, Teymur Sadatov tar və kamançada Azərbaycan xalq rəqsləri olan "On dörd" və "Simayi-şəms" rəqslərini ifa ediblər. Tələbələrin çıxışları iştirakçılar tərəfindən maraqla qarşılanıb.

Sonda tələbə-gənclər qonaqlara hədiyyələr təqdim ediblər.

**Könül Nərimanqızı**

# Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 illiyinə həsr olunmuş tədbir

Mayın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tarix və coğrafiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı və ADPU rəhbərliyinin dəstəyi ilə Azərbaycan Xalq Cümhuriyyətinin ya-




radılmasının 100 illiyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, ABŞ-ın Prinston Universitetinin professoru Maykl Reynolds, Tarix və coğrafiya fakültəsinin müəllim və tələbələri iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, mayın 28-də Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 100 ili tamam olur. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2017-ci il may ayının 16-da Azərbaycan Xalq Cümhurriyyətinin 100 illik yubileyi haqqında Sərəncam imzalayıb. Bununla yanaşı, dövlət başçımız 2018-ci il yanvar ayının 10-da 2018-ci ilin Azərbaycan Respublikasında “Azərbaycan Xalq Cümhuriyyəti İli” elan edilməsi haqqında Sərəncam imzalayıb. Hər iki Sərəncam ölkə rəhbərliyinin Azərbaycan Xalq Cümhuriyyətinə verdiyi yüksək qiymətin əyani ifadəsidir. Azərbaycan Xalq Cümhuriyyəti qədim və zəngin dövlətçilik tariximizdə böyük rol oynayıb. Azərbaycan Xalq Cümhuriyyəti xalqımızın azadlıq, istiqlal duyğularının güclənməsində mühüm rol oynayıb. Azərbaycan Xalq Cümhuriyyəti həyatımızın bir çox sahələrində, o cümlədən elm və təhsil sahəsində mühüm tədbirlər həyata keçirib. Azərbaycan Xalq Cümhuriyyəti bizim qürur mənbəyimizdir. Müstəqil Azərbaycan Respublikası Azərbaycan Xalq Cümhuriyyətinin varisidir.



“Azərbaycan Xalq Cümhuriyyətinin yaranması və süqutu” mövzusunda çıxış edən ABŞ-ın Prinston Universitetinin professoru Maykl Reynolds Qafqaz və Yaxın Şərq ölkələrinin tarixinin tədqiqi sahəsində apardığı elmi-tədqiqatlar barədə ətraflı məlumat verib. Professor Maykl Reynolds vurğulayıb ki, Azərbaycan Xalq Cümhuriyyətinin fəaliyyətinin araşdırılması onun apardığı elmi tədqiqatlarda xüsusi yer tutur. Azərbaycan Xalq Cümhuriyyəti mürəkkəb beynəlxalq siyasi şəraitdə fəaliyyət göstərib. Birinci Dünya müharibəsi, Osmanlı imperiyasının süqutu və Rusiya amili bu mürəkkəb beynəlxalq siyasi vəziyyəti səciyyələndirən əsas cəhətlər idi. Cümhuriyyət liderləri demokratik, dünyəvi dövlət qurmağa çalışırdılar. Müasir dövrümüzdə liberal-demokratik dəyərlər təhlükə altındadır. Azərbaycan Xalq Cümhuriyyətinin 100 il öncə bu sahədə əldə etdiyi naliyyətlər bu gün bizə stimul verir.

Məhəmməd Əmin Rəsulzadə irsinin tədqiqatçısı, yazıçı-publisist, Azərbaycan Radiosunun “Gecə düşüncə” proqramının müəllifi və aparıcısı Nəcibə Bağırzadə “Məhəmməd Əmin Rəsulzadə və Azərbaycan Cümhuriyyəti” mövzusunda çıxış edib. Nəcibə Bağırzadənin çıxışında Azərbaycan Xalq Cümhuriyyətinin Milli Şurasının sədri olmuş Məhəmməd Əmin Rəsulzadənin həyat və fəaliyyəti, xalqımızın azadlığı uğrunda apardığı fədakar və prinsipial mübarizə konkret elmi-tarixi faktlar əsasında öz əksini tapıb.

Tədbirdə Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının baş müəllimi Elman Mirzəyev “Şərqdə ilk demokrarik dövlət” mövzusunda məruzə ilə, həmin fakültənin III tədris ili tələbəsi Aytək Rəhimli isə təqdimatla çıxış edib. Çıxış və təqdimat iştirakçılar tərəfindən maraqla qarşılanıb.

Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının baş müəllimi Taleh Cəfərov və digərləri çıxış edərək Azərbaycan Xalq Cümhuriyyətinin fəaliyyəti və onun dövlətçilik tariximizdəki mövqeyi ilə bağlı fikir və mülahizələrini bölüşüblər.

Müəllim və tələbələrin fəallığı şəraitində keçən tədbirdə mövzu ilə bağlı maraqlı fikir mübadiləsi aparılıb, suallar cavablandırılıb, xatirə şəkli çəkdirilib.

# İbtidai təhsil fakültəsi tələbələrinin elmi-praktik konfransı

Mayın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev Mərkəzində İbtidai təhsil fakültəsinin tələbələrinin ümummilli li-



der Heydər Əliyevin anadan olmasının 95 illiyinə həsr olunmuş elmi-praktik konfransı keçirilib. Konfransda fakültənin professor-müəllim heyəti, bakalavriat səviyyəsinin tələbələri və magistrantlar iştirak ediblər.

Konfransı giriş sözü ilə ADPU-nun rektoru, professor Cəfər Cəfərov açaraq ulu öndər Heydər Əliyevin Azərbaycanın dövlətçilik tarixindəki xidmətlərindən, təhsil-tərbiyənin inkişafına və müəllim kadrları hazırlığına göstərdiyi yüksək diqqət və qayğıdan bəhs edib. Universitetdə yaradılan şəraitin magistrantların inkişafına, professor-müəllim heyətinin peşəkarlığının yüksəldilməsinə, təlimin keyfiyyətinin səmərəliliyinin artırılmasına istiqamətləndiyini bildirib.

Plenar iclasda İbtidai təhsil fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, magistrantlardan Günay Məmmədzadə, Nərgiz Feyziyeva və başqaları çıxış ediblər.

Plenar iclasdan sonra 4 bölmədə 150-yə yaxın məruzə dinlənilib. Konfrans iştirakçıların fəallığı şəraitində keçib.



# “Qafqaz İslam Ordusu” adlı tədbir

Mayın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) “Qafqaz İslam Ordusu” adlı tədbir keçirilib Tədbirdə ADPU-nun rəhbərliyi, Türkiyənin Azərbaycandakı Səfirliyinin Təhsil müşaviri Mahmud Ağırman, Mədəniyyət və tanıtma müşaviri İrfan Çiftçi, universitetin müəllim və tələbələri iştirak ediblər. Qeyd edək ki, tədbir ADPU-da təhsil alan türkiyəli tələbələrin İdarə Heyətinin təşəbbüsü və təşkilatçılığı ilə keçirilib. Tədbirdə əvvəlcə Azərbaycanın və Türkiyənin azadlığı, ərazi bütövlüyü uğrunda həlak olmuş şəhidlərin xatirələri bir dəqiqəlik sükutla yad edilib, Türkiyənin və Azərbaycanın dövlət himnləri səsləndirilib.

Tədbirdə qeyd edilib ki, bu gün 31 Mart soyqırımından sonra Azərbaycanın türk-müsəlman əhalisinə qarşı həyata keçirilən kütləvi qırğınların qarşısını almaq və Dağıstan müsəlmanlarına kömək etmək məqsədilə Osmanlı dövləti tərəfindən yaradılmış Qafqaz İslam Ordusunun 100-cü ildönümüdür.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbirdə çıxış edərək bildirib ki, Azərbaycanla-Türkiyə arasında münasibətlər yüksək səviyyədə inkişaf edir. İki qardaş ölkə bir çox sahələrdə, o cümlədən elm və təhsil sahəsində uğurlu əməkdaşlıq edir. Bu əməkdaşlı-









qda fəal iştirak edən ADPU Türkiyənin müxtəlif universitetləri ilə beynəlxalq simpoziumlar, konfranslar və digər elmi tədbirlər həyata keçirir. ADPU gələcəkdə bu əməkdaşlığı daha da genişləndirmək niyyətindədir. Rektor çıxışının sonunda tədbirin təşkilatçılarına təşəkkür edib və uğurlar arzulayıb.

Tədbirdə çıxış edən Türkiyənin Azərbaycandakı Səfirliyinin Təhsil müşaviri Mahmud Ağırman, Mədəniyyət və tanıtma müşaviri İrfan Çiftçi, türkiyəli tələbələrin İdarə Heyətinin sədri Hakan Köseyi Qafqaz İslam Ordusunun Azərbaycanın türk-müsəlman əhalisinə qarşı həyata keçirilən kütləvi qırğınlarının qarşısının alınmasındakı rolundan və Dağıstan müsəlmanlarına göstərdiyi kömədən geniş danışıblar.

Tədbirdə Qafqaz İslam Ordusu Hərəkatının 100-cü ildönümü ilə bağlı hazırlanmış videoçarx nümayiş etdirilib, tələbə-gənclər şeirlər səsləndiriblər.

“Savalan” qrupunun bədii rəhbəri, Azərbaycan Dövlət Akademik Opera və Balet Teatırının solisti Nicat Novruzlu mahnılar ifa edib.

Sonda xatirə şəkli çəkdirilib.

**Orxan Fəxrəddinoğlu**

# Pedaqoji Forumun “Müəllim və pedaqoji təhsil” mövzusunda növbəti dinləməsi

Mayın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji Forumunun (PF) növbəti dinləməsi keçirilib. Tədbirdə tanınmış və nüfuzlu təhsil eksperti, fəlsəfə doktoru Etibar Əliyevin “Müəllim və pedaqoji təhsil” mövzusunda məruzəsi dinlənilib. Dinləmədə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, professor-müəllimlər, şöbə müdirləri, təhsil mütəxəssisləri, pedaqoji sahədə tədqiqatlar aparmış alimlər və pedaqoji ictimaiyyətin nümayəndələri, təhsil ekspertləri, qeyri-hökumət təşkilatlarının təmsilçiləri və təhsil sahəsindən yazan jurnalistlər iştirak ediblər.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, Pedaqoji Forum peşəkar və yüksək səviyyəli mütəxəssislərin toplandığı bir məkana çevrilib. Gələcəkdə Pedaqoji Forumun tədbirlərinin daha geniş formada keçirilməsi nəzərdə tutulur.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov çıxış edərək təhsil eksperti Etibar Əliyevin fəaliyyəti barədə məlumat verib. Bildirib ki, Etibar Əliyev 1986-cı ildə Bakı Dövlət Universitetinin Fizika fakültəsini bitirib. Təyinatla 1986-1991-ci illərdə Kosmik Tədqiqatlar Elm-İstehsalat Birliyində elmi işçi, 1992-2002-ci illərdə Təhsil Nazirliyində aparıcı mütəxəssis vəzifəsində çalışıb. 2003-cü ildən Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Fəlsəfə İnstitutunun İdrak nəzəriyyəsi və elmin fəlsəfəsi şöbəsində böyük elmi işçi vəzifəsində işləyir. 2000-ci ildə “Elmi idrakın inkişafında fiziki ideyaların rolu” mövzusunda namizədlik dissertasiyası müdafiə edərək fəlsəfə elmləri namizədi alimlik dərəcəsi alıb. “Məktəbli fəlsəfəsi”, “Ədəbiyyat üzrə Nobel mükafatçıları”, “Yeni təhsil, tərbiyə və elm antologiyası”, “Boloniya bələdçisi”, “Müasir təhsil texnologiyalarının tezaurusu”, “Müəllimlərin peşəkar kompetensiyalarının inkişafına dəstək”, “Səriştəli valideyn” kitablarının müəllifidir. “Azərbaycan multikulturalizmi: dərslik” kitabının elmi redaktorudur. Hazırda “Elmin tarixi” kitabını tamamlamaq üzrədir. Etibar Əliyev “XXI Əsr Təhsil Mərkəzi” İctimai Birliyinin sədridir. Onun rəhbərlik etdiyi qeyri-hökumət təşkilatı elm və təhsil sahəsində 15-dan çox layihə icra edib. 200-dən çox elmi-publisistik məqalənin müəllifidir.





“Müəllim və pedaqoji təhsil” mövzusunda təqdimatla çıxış edən E.Əliyev qeyd edib ki, Pedaqoji Forum layihəsi uğurlu bir layihədir və Azərbaycanın təhsil tarixində qalacaq. Təqdimatın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edən E.Əliyev bildirib ki, “Müəllim və pedaqoji təhsil” mövzusu geniş və hərtərəfli mövzudur. Azərbaycan təhsili dünya təhsil sisteminə inteqrasiya edir. Ölkəmiz rəsmi qaydada Boloniya prosesinə qoşulub. Biz yaddaş məktəbindən idrak məktəbinə keçirik. Müəllim insanlara dünyəvi elmləri öyrətməlidir. O, həm də ilahiyyat elmlərini bilməlidir. Tədris üsulları müxtəlifdir. Hər bir tədris üsulunda müəllimin keyfiyyəti özünü göstərir. Elm isbatetmə vərdişi, səriştə, bacarıqdır. Müasir elmdə tarixilik paradiqması gündəmdədir.Aristotelə görə müdriklik ağıl və elmin daxili vəhdətidir. Müasir dünyamızda biliyin statusu dəyişib, o mütləq tətbiq olunmalıdır. Yüksəkeffektli müəllimin aşkara çıxarılması vacibdir. Əsas məqsəd müəllimin effektivliyinin yüksəldilməsi, qiymətləndirmə sistemində islahatların aparılmasıdır. Öz çıxışında ideal müəllim modeli barədə danışan E.Əliyev vurğulayıb ki, xalqımızın böyük elm və təhsil xadimi, görkəmli ziyalısı Mehdi Mehdizadə psixologiya və pedaqogikanı müəllimin qoşa qanadı adlandırıb. Çağdaş dövrümüzdə müəllim menecer, müşahidəçi, diaqnostik, təşkilatçı, məsləhətçidir. Müəllim şərh edir, izah edir, ruhlandırır, ilham verir. Müəllim daim tədqiqatla, intellektual axtarışlarla məşğul olmalıdır. Bilik öyrətməyin ən yaxşı üsulu tədqiqatdır. Təqdimatında “Bilik nədir?”, “İdrak nədir?” suallarına ABŞ, Rusiya, Böyük Britaniya, Finlandiya, Yaponiya, Almaniya kimi böyük və inkişaf etmiş ölkələrin təhsil təcrübələrinə əsasən ətraflı cavab verib. Eyni zamanda, dünyanın qabaqcıl ölkələrinin pedaqoji təhsil sistemi, müəllimlərin peşəkar inkişafı barədə geniş məlumat verib.

Diskussiya şəraitində keçən tədbirdə millət vəkili Fazil Qəzənfəroğlu, hüquqşünas Aydın Kərimov, Bakı Slavyan Universitetinin Tədris işləri üzrə prorektoru, professor Telman Cəfərov, professor İramin İsayev, dosent Məhərrəm Zülfüqarlı, dosent Əli Zalov, dosent Rəcəb Əliyev, dosent Fəxrəddin Yusifov, dosent Eldar Hacıyev, dosent Əhməd Qəşəmoğlu və başqaları çıxış edərək təqdimatı yüksək qiymətləndiriblər. Çıxış edənlər ali məktəb müəllimlərinin peşəkar və mənəvi keyfiyyətləri, ali məktəblərin akkreditasiyası, müəllim hazırlığı, tədris proqramları, alternativ dərsliklər, elmin populyarlaşdırılması və digər vacib məqamlarla bağlı öz fikir və mülahizələrini tədbir iştirakçılarının diqqətinə çatdırıblar.

Tədbirə yekun vuran rektor Cəfər Cəfərov vurğulayıb ki, belə elmi-metodiki toplantılar dialoq imkanlarının,yeni fikir və ideyaların ortaya çıxmasına kömək edir. Təhsil xalqın, millətin təhlükəsizliyi məsələsidir. Azərbaycanın gələcəyi, hərtərəfli inkişafı təhsildən asılıdır. Yüksək keyfiyyətli təhsil xalqımızın dünyanın sivil və mütərəqqi xalqları arasında olmasını şərtləndirən əsas amildir. Rektor çox maraqlı və geniş məzmunlu təqdimata görə E.Əliyevə təşəkkür edib və uğurlar arzulayıb.

# Reytinq Qiymətləndirilməsi ilə bağlı hazırlanmış sənəd layihələrinin müzakirəsi



Mayın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) professor-müəllim heyətinin, kafedraların və fakültələrin illik fəaliyyətinin Reytinq Qiymətləndirilməsi ilə bağlı hazırlanmış sənəd layihələrinin müzakirəsi keçirilib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, professor-müəllim heyətinin, kafedraların və fakültələrin illik fəaliyyətinin Reytinq Qiymətləndirilməsi ilə bağlı hazırlanmış sənəd layihələrinin müzakirəsi olduqca vacibdir. Biz bu sənədləri çevik şəkildə müzakirə və tətbiq etməliyik.

ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov çıxış edərək bildirib ki, tədris prosesinin keyfiyyətinin artırılması və professor-müəllim heyətinin obyektiv rəğbətləndirmə sisteminin yaradılması məqsədilə müvafiq əmr imzalanıb. Həmin əmrlə ADPU-da Reytinq Qiymətləndirilməsi haqqında Müvəqqəti Qaydalar təsdiq edilib. Reytinq qiymətləndirilməsi haqqında Müvəqqəti Qaydalara əsasən professor-müəllim heyətinin 2018-ci il üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün müvafiq hazırlıq işlərinə başlanılıb, qaydaların icrasını təmin etmək üçün Universitetin Keyfiyyət Komissiyası yaradılıb. Universitetin Keyfiyyət Komissiyası katibliyinin işinin həyata keçirilməsi Keyfiyyətin təminatı şöbəsinə həvalə edilib. Aidiyyəti struktur bölmələri qarşısında əmrdən irəli gələn vəzifələrin həyata keçirilməsi qoyulub.

Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Rəşad Sadıqov bildirib ki, Reytinq Qiymətləndirməsinin tətbiqinin əsas məqsədi tədris prosesinin keyfiyyətinin artırılması üçün professor-müəllim heyətinin, kafedraların və fakültələrin illik fəaliyyətini obyektiv, vahid meyarlarla müəyyənləşdirməkdir. Reytinq Qiymətləndirməsinin yaradılması konsepsiyası universitetin, o cümlədən fakültə və kafedraların fəaliyyətinin müasir dövrdə ali təhsil müəssisələri qarşısında qoyulan milli və beynəlxalq tələblərə uyğunlaşdırılması ilə bağlıdır. Reytinq Qiymətləndirməsi Azərbaycan Respublikasının Konstitusiyasına, Azərbaycan Respublikasının qanunlarına, digər normativ-hüquqi aktlarına, universitetinin Nizamnaməsinə, beynəlxalq və Azərbaycan ali təhsil müəssisələrində qiymətləndirmənin tətbiqi təcrübəsinə əsasən tərtib edilmişdir. Reytinq Qiymətləndirməsinin əsas məqsədləri professor-müəllim heyətinin, kafedraların və fakültələrin mövcud pedaqoji, elmi-tədqiqat, tərbiyə və ictimai fəaliyyətinin vəziyyətinin obyektiv şəkildə qiymətləndirilməsi, professor-müəllim heyətinin universitet daxilində və ictimai həyatdakı fəaliyyətinin səviyyəsinin vahid meyarlar əsasında qiymətləndirilməsi, fakültələrin və kafedraların resurslarının, tədris işinin təşkilinin və elmi-tədqiqat işlərinin səviyyəsinin müəyyənləşdirilməsi, professor-müəllim heyətinin, kafedraların və fakültələrin tədris prosesinin yaxşılaşdırılmasına fərdi və kollektiv töhfəsini nəzərə almaqla onların maddi və mənəvi həvəsləndirilməsi, professor-müəllim heyətinin, kafedraların və fakültələrin Reytinq Qiymətləndirməsinin nəticələrini ümumiləşdirməklə onların fəaliyyətinin dinamikasının izlənilməsidir. Reytinq Qiymətləndirməsi pedaqoji fəaliyyət, elmi-tədqiqat fəaliyyəti və ictimai fəaliyyət üzrə müəyyənləşdirilir. Hər bir fəaliyyət növü müəyyən edilmiş müvafiq balla qiymətləndirilir və toplanan ballar əsasında reytinq müəyyən edilir. Kafedra üzrə Reytinq Qiymətləndirməsinin hazırlanması üçün hər bir müəllim tərəfindən il ərzində həyata keçirilmiş fəaliyyəti özündə əks etdirən məlumatlar fərdi qaydada kafedraya təqdim edilir və onların əsasında kafedra üzrə müvafiq cədvəl doldurulur. Fakültə üzrə Reytinq Qiymətləndirməsinin hazırlanması üçün hər bir kafedra tərəfindən il ərzində həyata keçirilmiş fəaliyyəti özündə əks etdirən məlumatlar dekanlığa təqdim edilir və onların əsasında fakültə üzrə müvafiq cədvəl doldurulur. Hər il dekabrın 1-dək professor-müəllim heyəti tərəfindən təqdim edilmiş sənədlər əsasında doldurulmuş reytinq cədvəli onun dəqiqliyinə cavabdehlik daşıyan kafedra müdiri və dekan tərəfindən təsdiq edildikdən sonra sənədlər aidiyyəti üzrə təqdim edilir. Təqdim edilmiş sənədlərin və məlumatların dəqiqliyi universitetin rektoru yanında Keyfiyyət Komissiyası tərəfindən yoxlanılır və universitet üzrə Reytinq Qiymətləndirməsinin yekun aktı tərtib edilir. Reytinq Qiymətləndirməsinin nəticələri hər təqvim ilinin sonunda universitet Elmi Şurasının iclasında təsdiq edilir.

Reytinqin hesablanma qaydaları və nəticələri barədə də ətraflı məlumat verən dosent R.Sadıqov qeyd edib ki, fakültələr tərəfindən Reytinq Qiymətləndirməsi üçün təqdim edilən sənədlərin araşdırılması, reytinqlərin hesablanması, müəyyən təhlillər üçün meyarlarının, metodların və vasitələrin işlənilməsi universitetin rektoru yanında Keyfiyyət Komissiyası tərəfindən aparılır və komissiyanın tərkibi hər il Elmi Şuranın qərarı ilə müəyyən olunur. Keyfiyyət Komissiyanın üzvlərinin Reytinq Qiymətləndirməsi ilə bağlı vəzifələrinə fakültələrdən daxil olan sənədlərin həqiqiliyini və obyektivliyini yoxlamaq, professor-müəllim heyətinin, kafedra və fakültələrin reytinqini hesablamaq, il üzrə reytinq qiymətləndirməsinin nəticələri haqqında Yekun Akt tərtib edib rektora təqdim etmək, universitet daxilində Reytinq Qiymətləndirməsi ilə bağlı izahat və maarifləndirmə işləri aparmaq, analitik və statistik informasiya hazırlamaq, Reytinq Qiymətləndirməsi ilə bağlı digər məsələləri həll etmək daxildir.



Müəllimlərin, kafedra və fakültələrin topladıqları bala əsasən onların reytinqi nümunəvi, fəal və fəal olmayan kimi müəyyənləşdirilir. Nümunəvi kateqoriyaya daxil olan müəllim, kafedra, kafedra müdiri, fakültə və dekan maddi və ya mənəvi rəğbətləndirilir. Fəal olmayan müəllimlərin, kafedra və fakültələrin fəaliyyəti təhlil olunur, nəzarətə götürülür və lazım olduqda universitet Elmi Şurasında müzakirə olunur. Reytinq Qiymətləndirməsinin nəticələrinə görə rəğbətləndirmənin forması və həcmi rektorun təklifi əsasında universitet Elmi Şurası tərəfindən təsdiq edilir. Reytinq Qiymətləndirməsinin nəticələri cildlənərək tanışlıq üçün universitetin Kitabxana-İnformasiya Mərkəzində saxlanılır. Professor-müəllim heyətinin, kafedraların və fakültələrin reytinq nəticələrinin dinamikası rəhbərliyə idarəetmədə illik fəaliyyətin qiymətləndirilməsinə əsasən diferensial əməkhaqqı sisteminin tətbiqində, vəzifə seçkilərində (müsabiqə yolu ilə) və ya təyinatında, əmək müqaviləsi müddətinin razılaşdırılmasında, elmi-tədqiqat işlərinin aparılmasında, elmi konfranslarda iştrak edilməsində, peşəkar inkişafla bağlı kurslara göndərilməsində, avadanlığın alınmasında qərar vermək üçün obyektiv əsas yaradır. Bu qaydalar universitetin Elmi Şurasında qəbul olunur və rektor tərəfindən təsdiq olunur. Qaydalara əlavə və dəyişikliklər eyni prosedura ilə həyata keçirilir.

Dosent R.Sadıqov qeyd edib ki, universitetdə tələbələrin müəllimdən məmnunluğu haqqında anonim sorğu keçiriləcək. Sorğuya müəllimin mühazirə və seminarları təq□dimatı əsasında keçirməsi, dərsi səlis və aydın şəkildə izah etməsi, interaktiv metodlardan istifadə etmə bacarığı, tələbələrə fərdi yanaşması, onların fəal iştirakına şərait yaratması və dərsdənkənar köməklik göstərməsi, verdiyi sərbəst işlərin faydalılığı, kollokvium və imtahanlardan müvəffəq qiymət almaqda keçdiyi dərsin əhəmiyyətli olduğuna inam, bütün mövzuların mühazirə materiallarını təqdim etməsi,verdiyi qiymətlərin obyektivliyi ilə bağlı suallar daxil edilib.

Sonra təqdim edilən sənəd layihələri barədə müzakirə aparılıb. Professor Asəf Zamanov, dosent Sənan Əliyev, professor Buludxan Xəlilov, professor Fərrux Rüstəmov, dosent Şahin Pənahov, dosent Maqsud Nəcəfov, dosent Arzu Daşdəmirov, professor Müseyib İlyasov, professor İramin İsayev, dosent Ənvər İmanov, pedaqogika üzrə fəlsəfə doktoru Qəmər İsayeva və başqaları çıxış edərək sənədlə bağlı fikir və mülahizələrini bölüşüblər.

Sonda fakültə və kafedraların sənəd layihəsi ilə bağlı təkliflərini hazırlayaraq bir ay müddətində təqdim etmələri qərara alınıb.

# Pedaqoji təcrübənin yekun konfransı

Mayın 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) əyani təhsilalma forması üzrə təhsil alan IV tədris ili tələbələrinin pedaqoji təcrübəsinin yekun konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin, Bakı Şəhər İcra Hakimiyyətinin və Səhiyyə Nazirliyinin müvafiq idarələrinin təmsilçiləri, ümumtəhsil müəssisələrinin rəhbərləri və başqaları iştirak ediblər. Konfrans iştirakçıları əvvəlcə universitetin tələbələrinin əl işlərindən ibarət sərgi ilə tanış olublar, sonra konfrans öz işini Böyük Akt zalında davam etdirib. Konfransda öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Konfransı giriş sözü ilə açan Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov tələbələri pedaqoji təcrübəni başa vurmaları münasibətilə təbrik edib və onlara uğurlar arzulayıb. Bildirib ki, builki pedaqoji təcrübə forma və məzmununa görə fərqlənib. Pedaqoji təcrübənin təşkili və keçirilməsi haqqında statistik məlumatlar əsasında çıxış edən E.Aslanov bildirib ki, tələbələr təhsil ixtisasları qrupuna daxil olan ali təhsilin bakalavriat səviyyəsinin ixtisasları üzrə 2014-cü ildə təsdiq olunmuş təhsil proqramlarına (standartlara) uyğun olaraq 14 həftəlik pedaqoji təcrübə keçiblər. Tələbələr ilk dəfə 14 həftə və çoxtərəfli müqavilələrə əsasən Təhsil Nazirliyinin 126 məktəbində, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin 329 məktəbində, 24 liseydə, Bakı Şəhər İcra Hakimiyyətinin Məktəbəqədər Təhsil Müəssisələri və Uşaq Evləri İdarəsinin 344 məktəbəqədər təhsil müəssisəsində və 6 özəl müəssisədə, o cümlədən filiallar üzrə 34 məktəbdə,




Abşeron, Xızı və Şirvan Milli Parkı istiqamətində çöl təcrübəsi keçiblər.

Əyani təhsilalma forması üzrə 1885 nəfər, qiyabi təhsilalma forması üzrə 166 nəfər, filiallar üzrə 582 nəfər tələbə olmaqla cəmi 2472 nəfər bakalavr və 415 nəfər magistr pedaqoji təcrübədə olublar. Cari tədris ilində 63313 saat dərs yükü məktəblərdə təşkil olunan metodika dərslərinə ayrılıb. Dosent E.Aslanov qeyd edib ki, pedaqoji təcrübənin yüksək səviyyədə keçirilməsinə nail olunub. Tələbələr pedaqoji təcrübədə fəal iştirak ediblər. Təcrübəçi tələbələr birinci həftədə hazırlıq işlərini görməyə, dərsləri müşahidə etməklə vaxtı səmərəli bölərək sınaq və açıq dərsləri sərbəst hazırlamağa vaxt qazanıblar. Təcrübəçi tələbələrin ardıcıl olaraq 12 qiymətləndirilən dərsi keçmələri onlara bir sıra bacarıqlar əldə etməyə kömək edib. Belə ki, onlar standart dərs tiplərindən kənara çıxaraq qeyri-standart dərslərin (ekskursiya, laboratoriya məşğələsi, dəyirmi masa, debat, disput və s.) də təşkilinə imkan əldə ediblər. Tələbələr fənn bölmələrinin sonunda təşkil edilən kiçik summativ qiymətləndirmələrdə iştirak etməklə onların keçirilməsi qaydalarını öyrəniblər. Bu da onların gələcək peşə fəaliyyətlərində içtirak və icra edəcəkləri təlim prosesinin ardıcıllığını təmin edib. Həftə ərzində bir sınaq dərsinin keçirilməsi tələbələrin ciddi hazırlaşmalarına, resursları əldə etmələrinə və arzuladıqları səviyyədə keçmələrinə imkan verib. Məktəbdə bir sınaq dərsinin təşkili tələbənin öyrənmək, bacarmaq məqsədilə şagirdlərlə, təhkim olunduğu siniflə pedaqoji işlər, o cümlədən sinif saatı, tərbiyəvi söhbətlər aparmasına, şagirdlərlə yaxından ünsiyyət qurmasına, onları dərindən tanımasına, onlar üzərində psixoloji tədqiqatların və s. aparılmasına şərait yaradıb. Təcrübəçi tələbələr və məktəbin kollektivi üçün metodistin əsas məsələlərdən biri olan fəal təlim metodlarının tətbiqi il açıq dərsi təşkili olunub. Təcrübəçi tələbələrin fəal iştirakı ilə məktəblərdə müxtəlif mədəni-kütləvi tədbirlər keçirilib. Metodistlər isə pedaqoji təcrübədə daha geniş fəaliyyət göstərmək imkanı qazanıblar. Pedaqoji təcrübənin sonuncu həftəsində hesablar dinlənilib, müəllim və tələbələrin fəaliyyəti qiymətləndirilib. Bütün bunları nəzərə alaraq demək olar ki, 14 həftəlik pedqoji təcrübə tələbələrə müəllim kimi yetişmələrinə, fasilitatorluq bacarıqları əldə etmələrinə əlverişli şərait yaradıb və tələbələrə pedaqoji fəaliyyət uğurları bəxş edib.

Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdir müavini Rəşad Tağıyev çıxış edərək ölkəmizdə aparılan təhsil islahatlarının təhsilin inkişafına və mütəxəssis hazırlığına müsbət təsir etdiyini bildirib. Qeyd edib ki, gələcəkdə Bakı Şəhəri üzrə Təhsil İdarəsi pedaqoji təcrübənin daha səmərəli təşkili üçün ADPU ilə əməkdaşlığı genişləndirməyi planlaşdırır.

Konfransda SABAH qruplarının tələbələri qazandıqları bilik və bacarıqları, həmçinin müəllimlik peşəsinin müqəddəs, şərəfli və məsuliyyətli peşə olduğunu əks etdirən səhnəcik və slayd-şou göstəriblər.

Konfransda çıxış edən Məktəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin tələbəsi Fidan Hacıyeva, İbtidai təhsil fakültəsinin tələbəsi Şahanə Məmmədli, Riyaziyyat və informatika fakültəsinin tələbəsi Günay Quliyeva, Fizika və texnologiya fakültəsinin tələbələri Könül Məmmədli, Nigar Rəhimli, həmçinin Filologiya fakültəsinin, Kimya və biologiya fakültəsinin, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin tələbələri pedaqoji təcrübə ilə bağlı təəssüratlarını bölüşərək göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə, eləcə də pedaqoji təcrübə keçdikləri məktəblərin direktorlarına, pedaqoji təcrübə rəhbərlərinə, müəllimlərə, metodistlərə təşəkkür ediblər. Tədbirdə "Müəllim andı" səsləndirilib.



Konfransda 2017-2018-ci tədris ilində əyani təhsilalan IV tədris ili tələbələri arasında keçirilmiş pedaqoji təcrübəyə dair sosioloji sorğunun nəticələri açıqlanıb.

Konfransda yekun sözü ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov vurğulayıb ki, Azərbaycan Xalq Cümhuriyyətinin varisi olan müstəqil Azərbaycan Respublikasının hərtərəfli inkişafında müəllimlərin də mühüm rolu var. Müasir dövr qarşımızda yeni tələblər və vəzifələr qoyur. Bilik və bacarıqlar çağdaş dövrün tələblərinə uyğun qurulmalıdır. Biz Azərbaycan məktəbinin fəaliyyətinin daha da yaxşılaşdırılması üçün vicdanla, ləyaqətlə fəaliyyət göstərməliyik. Bununla biz ölkəmizin daha da inkişaf etməsinə, dövlətimizin güclənməsinə öz töhfələrimizi vermiş olarıq. Siz bu işi layiqincə davam etdirməlisiniz. Rektor çıxışının sonunda tələbələrə uğurlar arzulayıb və onlara həmişə ADPU-nun adını uca tutmağı tövsiyə edib.

# ADPU-nun Cəlilabad Filialında "Azərbaycanı işıqlı gələcəyə aparan lider-Heydər Əliyev" mövzusunda tədbir

Mayın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında tədbirlər planına müvafiq olaraq ümummilli lider Heydər Əliyevin anadan olmasının 95-ci ildönümünə həsr olunmuş "Azərbaycanı işıqlı gələcəyə aparan lider-Heydər Əliyev" mövzusunda tədbir keçirilib.

Tədbiri giriş sözü ilə açan filialın direktor müavini Eyvaz Məmmədov bildirib ki, Heydər Əliyev Azərbaycanın dövlət müstəqilliyinin banisidir. Cəmiyyətin bütün sahələrində Heydər Əliyevin böyük xidmətləri vardır. Qeyd edib ki, Azərbaycan təhsilinin və elminin inkişafında Ulu Öndərin misilsiz xidmətləri vardır. Heydər Əliyevin hakimiyyəti illərində Azərbaycanda ən müxtəlif sahələr üzrə böyük elmi məktəblər yaranıb. Möhtərəm Prezidentimiz cənab İlham Əliyevin dövlətçilik siyasətinə harmonik yanaşmaları və analitik təfəkkürü ilə müstəqil Azərbaycan dövlətçiliyinin yeni dövrü formalaşır. Prezident İlham Əliyev Azərbaycan Respublikasını qətiyyətlə irəli aparan qüdrətli dövlət xadimidir.

Məruzəçi, tarix üzrə fəlsəfə doktoru Mürvət Abbasov bildirib ki, müstəqil dövlətin siyasi prioritetlərinin önə çıxarılması, yeni idarəetmə strukturunun formalaşdırılması, daxili sabitliyin yaradılması, beynəlxalq aləmdə tərəfdaşlar tapmaq, iqtisadi sahədə islahatlar həyata keçirmək, dövlət ideologiyasının formalaşdırılması Heydər Əliyevin həll etdiyi əsas vəzifələrdən olub.



Tədbir tələbələrin çıxışları, şeirləri və Heydər Əliyev haqqında videoçarxların təqdim edilməsi ilə yekunlaşıb.

## ADPU-nun nəzdində ADPK-də ulu öndər Heydər Əliyevin 95 illik yubileyinə həsr olunmuş "Mənalı ömrün izi ilə" adlı tədbir



Mayın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) ulu öndər Heydər Əliyevin 95 illik yubileyinə həsr olunmuş "Mənalı ömrün izi ilə" adlı tədbir keçirildi.

Tədbirdə giriş sözü ilə kollecin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov çıxış edərək Azərbaycanın keçmiş SSR məkanında inkişaf etmiş dövlət olmasında, həmçinin müstəqil dövlət kimi formalaşmasında, ölkəmizdə sabitliyin bərqərar olunmasında Heydər Əliyevin danılmaz xidmətlərini xüsusi vurğuladı.



Tədbirdə iştirak edən "İki sahil" qəzetinin baş redaktoru, Yeni Azərbaycan Partiyasının (YAP) Siyasi Şurasının üzvü, Əməkdar jurnalist Vüqar Rəhimzadə, YAP-ın Gənclər Birliyinin sədri, Rabitə İşçiləri Həmkarlar İttfaqı Respublika Komitəsinin sədri Seymur Orucov, Yasamal Rayon İcra Hakimiyyətinin İctimai-siyasi və humanitar məsələlər üzrə şöbə müdiri Zöhrab Cəfərov Heydər Əliyevin həyatı və fəaliyyəti haqqında çıxış etdilər.

Vüqar Rəhimzadə çıxışında bildirib ki, Heydər Əliyevin yenidən hakimiyyətə gəlməsi ilə Azərbaycanda vətəndaş müharibəsinin qarşısı alındı, ölkəmizdə sabitlik bərpa olundu. V.Rəhimzadə Heydər Əliyevin misilsiz xidmətlərindən və Onun siyasi kursunu bu gün uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müstəqil ölkəmizin inkişafı yolunda var qüvvəsi ilə çalışmasından ətraflı bəhs etdi.

Tədbirdə çıxış edən Seymur Orucov Heydər Əliyevin gənclərə üstünlük verməsini xüsusi vurğuladı.

Tədbir kollecin tələbələrinin ifasında ədəbi-bədii kompozisiya ilə başa çatdı.

## ADPU-nun Quba Filialında ümummilli lider Heydər Əliyevin 95 illik yubileyi münasibətilə silsilə tədbirlər

Mayın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialının kollektivi Quba şəhərində yerləşən Heydər Əliyev Muzeyini ziyarət edib, Heydər Əliyevin büstü önünə əklil və gül dəstələri qoyub, muzeydə Ulu Öndərin həyat və fəaliyyətini əks etdirən şəkil və məlumatlarla tanış olublar.



Mayın 4-də filialın kitabxanasında "Heydər Əliyev və müasir Azərbaycan gəncliyi" mövzusunda dəyirmi masa keçirilib. Mövzu ilə əlaqədar hazırlanan təqdimatlar əsasında fərqlənən tələbələrə filialın Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri Türkanə Abışova tərəfindən sertifikatlar təqdim olunub.

Mayın 7-də filialda "Heydər Əliyev ideya-nəzəri irsində insan amili" mövzusunda konfrans keçirilib. Konfransda əvvəlcə ümummilli lider Heydər Əliyevin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib, Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Konfransı giriş sözü ilə açan filialın direktoru, professor Əli Allahverdiyev Ulu Öndərin həyat və siyasi fəaliyyətindən, Onun müasir Azərbaycanın memarı və qurucusu olmasından, "Tarixin böyük azərbaycanlısı" adını qazanmış ulu öndər Heydər Əliyevlə fəxr etməsindən, bu gün Heydər Əliyev siyasi kursunun Prezident cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilməsindən ətraflı danışıb.

Sonra konfransda filialın Pedaqoji fakültəsinin dekanı, filologiya üzrə fəlsəfə doktoru Qələmşah İdrisov, filialın tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, TEC-in sədr müavini Azər Zahirov, Tələbə Gənclər Təşkilatının (TGT) sədri Həcər Seyidəhmədova, "Tarix və coğrafiya müəllimliyi" ixtisasının IV tədris ili tələbəsi Mina Qubatova, "İbtidai sinif müəllimliyi" ixtisasının II tədris ili tələbəsi Aytac Nəzərova, "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasının I tədris ili tələbəsi Ayşən Hüseynova çıxış ediblər.

Sonda Ümummilli Liderin həyat və fəaliyyətini əks etdirən videoçarx nümayiş olunub.

## ADPU-nun Şamaxı Filialında ümummilli lider Heydər Əliyevin anadan olmasının 95-ci ildönümü münasibətilə silsilə tədbirlər



Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı Filialında (ADPU) ümummilli lider Heydər Əliyevin anadan olmasının 95-ci ildönümünün qeyd olunması ilə əlaqədar tədbirlər planı təsdiq olundu. Təsdiq olunmuş tədbirlər planına əsasən silsilə tədbirlər keçirildi.

Aprelin 10-da filialda tələbə təşkilatlarının təşkilatçılığı ilə "Ən yaxşı məqalə" müsabiqəsi elan olundu. Aprelin 20-də Təşkilat Komitəsinə təqdim olunan məqalələr Ümummilli Liderin həyatının və uğurlu siyasətinin əsas məqamlarını özündə əks etdirirdi. Müsabiqədə 100-dən çox tələbə iştirak edirdi. Mövzu baxımından maraqlı faktları əhatə edən məqalələrdən Aytac Mehralıyeva I yerə, Gültən Söhbətli və Dürdanə Ədilova II yerə, Gülşən Hacıyeva və Mehriban Əliyeva III yerə, daha 10 məqalə isə həvəsləndirici yerə layiq görüldü.

Aprelin 15-də filialın tələbələri arasında dama üzrə çempionat keçirildi. 3 saata qədər davam edən çempionatda "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının IV tədris ili tələbəsi Şahsuvar Əhmədov I yerə, "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının III tədris ili tələbəsi Rəşidə Zeynallı II yerə, "Tarix və coğrafiya müəllimliyi" ixtisasının IV tədris ili tələbəsi Kamran Məmmədov isə Münsiflər Heyəti tərəfindən III yerə layiq görüldülər.

Aprelin 24-də "Ən yaxşı gül, əl işləri və rəsm müsabiqəsi" keçirildi. Tədbirdə filialın bütün tələbələri xüsusi fəallıqla iştirak etdilər. Onların öz əlləri ilə əkib becərdikləri güllər, hazırladıqları əl işləri, bişirdikləri şirniyyatlar və rəsmlər eyni zamanda satışa qoyuldu. Satışdan əldə olunan vəsait xeyriyyə məqsədilə Şəhriyar qəsəbəsində yaşayan, 2 övladı iflic xəstəsi olan bir ailəyə bağışlandı. Filialın kollektivi tələbələrin bu təşəbbüsünü qürur hissi ilə qarşıladı.

Bundan əlavə, tələbələrin hazırladıqları rəqs və şeir kompozisiyaları tədbir iştirakçılarında yüksək əhvali-ruhiyyə yaratdı.

Mayın 1-də Humanitar və xüsusi fənlər kafedrasının müəllimi, tarix üzrə fəlsəfə doktoru Fariz Xəlilinin Şamaxı şəhər Heydər Əliyev Mərkəzində ümummilli lider Heydər Əliyevin anadan olmasının 95-ci ildönümünə həsr olunmuş "Heydər Əliyev və müasir beynəlxalq münasibətlər" mövzusunda seminarı keçirildi. Seminarda filialın "Tarix və coğrafiya müəllimliyi" ixtisasının tələbələri iştirak edirdilər.

İştirakçılara ilk olaraq mərkəzin hazırladığı "Heydər Əliyev və gənclər siyasəti" mövzusunda film nümayiş olundu. Sonra mərkəzin muzeyində Fariz Xəlillinin bələdçiliyi ilə beynəlxalq münasibətlər sahəsində Heydər Əliyevin uğurları və onun haqqında dünya liderlərinin xatirələri əyani şəkildə tələbələrə çatdırıldı.

Fariz Xəlilli mövzu ilə bağlı geniş məruzə etdi. Tələbələr seminarda xüsusi fəallıq nümayiş etdiriblər.

Mayın 7-də Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı ilə "Heydər Əliyev və müasir gənclik" mövzusunda dəyirmi masa keçirildi. Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə başlayan tədbiri filialın tədris və elmi işlər üzrə direktor müavini, fəlsəfə doktoru Şasəddin Mikayılov açdı və Ulu Öndərin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edildi. Sonra TGT-nin sədri Hilal Mürsəlov çıxış edərək ulu öndər Heydər Əliyevin həyatından, Azərbaycana rəhbərlik etdiyi bütün dövrlərdə həyata keçirdiyi uğurlu siyasətinin nəticələrindən bəhs etdi.

Tədbirdə "Müdrikilik zirvəsi" adlı videoçarx nümayiş olunudu.

Filialın fəal tələbələrindən Nicat Məmmədov, Nərmin Maqsudova, Aytac Mehralıyeva, Heydər Sadıqov, Sədi İsrafilov, Patima Cirinqova, Məhərrəm Məhərrəmov, Nəsibli Güldəstə və İltizam Ədilov öz çıxışlarında Heydər Əliyevin azərbaycançılıq ideologiyasının yaradıcısı olmasından, hakimiyyətə gəldiyi gündən Azərbaycan gənclərinə göstərdiyi qayğıdan, ölkə iqtisadiyyatının bütün sahərində, həmçinin təhsil sahəsində həyata keçirdiyi islahatlar barədə danışdılar. Tədbir tələbələrin maraqlı disskusiyyası şəraitində davam etdirildi.

Sonda tələbə-gənclər Ümummilli Liderin şah əsəri olan müstəqil Azərbaycanın vətəndaşları olmaqdan qürur hissi keçirdiklərini ifadə etdilər.

Filialın akt zalında Heydər Əliyevin anadan olmasının 95-ci ildönümünə həsr edilmiş elmi-nəzəri konfrans keçirildi. Filialın professor-müəllim və tələbə heyətinin iştirak etdiyi tədbir Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə başlandı.

Tədbirdə çıxış edən tədris və elmi işlər üzrə direktor müavini, fəlsəfə doktoru Şasəddin Mikayılov Heydər Əliyevin anadan olmasının 95-ci ildönümü ilə əlaqədar filialda keçirilən tədbirlər silsiləsini iştirakçıların diqqətinə çatdırdı. Sonra məruzə ilə çıxış edən tarix üzrə fəlsəfə doktoru, dosent Mayıl Alıcanov Ümummilli Liderin istər Sovetlər Birliyi dövründə, istərsə də Azərbaycanın müstəqilliyi dövründə xalqa göstərdiyi diqqətdən, dövlətçiliyi qoruyub saxlamaq uğrunda apardığı mübarizədən, bugünkü inkişafın məhz Onun siyasətinin uğurunun nəticəsi olmasından danışdı.

Sonra "Ən yaxşı məqalə" müsabiqəsində iştirak edərək yer tutan tələbələrdən Aytac Mehralıyeva, Gültən Söhbətli və Dürdanə Ədilova çıxış etdilər. Müsabiqədə layiqli yer turan tələbələr diplomla mükafatlandırıldılar.

Silsilə tədbirlərin davamı olaraq mayın 10-da filialın professor-müəllim heyəti və tələbələri Şamaxı Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə Şamaxı şəhərinin Heydər Əliyev parkında Heydər Əliyevin anadan olmasının 95-ci ildönümü ilə əlaqədar keçirilən tədbirdə iştirak etdilər. Rayon ictimaiyyətinin iştirak etdiyi tədbirdə Ümummilli Liderin abidəsi ziyarət olundu. Tədbir iştirakçıları abidənin önünə tər güllər düzərək Ulu Öndərə hörmət və ehtiramlarını bildirdilər. Sonra tədbir konsert proqramı ilə davam etdirildi.

## ADPU-nun Ağcabədi Filialında ulu öndər Heydər Əliyevin 95 illik yubileyinə həsr olunmuş "Müstəqil Azərbaycan Heydər Əliyevin şah əsəridir" mövzusunda elmi-praktik konfrans



Mayın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında ulu öndər Heydər Əliyevin 95 illik yubileyinə həsr olunmuş "Müstəqil Azərbaycan Heydər Əliyevin şah əsəridir" mövzusunda elmi-praktik konfrans keçirildi. Əvvəlcə ulu öndər Heydər Əliyevin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva bildirdi ki, Azərbaycan xalqının xilaskarı, ümummilli liderimiz Heydər Əliyevin 95 illik yubileyi münasibətilə silsilə tədbirlər həyata keçirilir. ADPU-nun Ağcabədi Filialında da ulu öndər Heydər Əliyevin əziz xatirəsinə həsr olunmuş bir sıra tədbirlər həyata keçirilir ki, bugünkü elmi-praktik konfrans da həmin tədbirlərdən biridir.

Sonra məruzələr dinlənildi.

"Heydər Əliyevin dövlətçilik fəlsəfəsi" mövzusunda məruzə edən filialın tərbiyə işləri üzrə direktor müavini, dosent Mahir Səlimov bildirdi ki, Azərbaycan xalqının tarixində və taleyüklü məsələlərinin həllində müstəsna xidmətləri olan tarixi şəxsiyyətlər, görkəmli siyasət və dövlət adamları çox olmuşdur. Onlar zaman-zaman gördükləri böyük işləri və əməlləri ilə yadda qalmış və unudulmamışlar. Belə tarixi şəxsiyyətlər arasında Azərbaycan xalqının Ümummilli Lideri adını qazanmış görkəmli dövlət xadimi, dünya miqyaslı siyasətçi Heydər Əliyevin xüsusi rolu vardır. Çünki dövlət xadimlərimizdən ancaq bu dahi şəxsiyyət milli lider şəviyyəsinə yüksələ bilmişdir.

Ümummilli liderimiz Heydər Əliyevin öz xalqına misilsiz xidmətlərindən danışan məruzəçi onun hüquqi, demokratik və dünyəvi dövlət quruculuğu sahəsində yürütdüyü məqsədyönlü siyasətin əhəmiyyətini açıqladı. Qeyd etdi ki, bu gün ölkəmiz həmin siyasətin uğurlarını hiss edir, onunla yaşayır və faydalanır. Bu siyasət Ulu Öndərimizin layiqli varisi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir.

Dosent M.Səlimov məruzəsinin sonunda ümummilli liderimiz Heydər Əliyevə sonsuz məhəbbət və ehtiramını ifadə edərək Onun işıqlı əməllərinin daim yaşayacağını və unudulmayacığını bildirdi.

Növbəti məruzə üçün söz filialın dosenti, tarix üzrə fəlsəfə doktoru Məhəmməd Hüseynova verildi. "Müstəqil Azərbaycan dövlətinin xarici siyasət kursunun formalaşmasında Heydər Əliyevin rolu" mövzusunda məruzə edən M.Hüseynov ümummilli lider Heydər Əliyevin Azərbaycan xalqının tarixində taleyüklü məsələlərin həllində əvəzsiz xidmətləri olan tarixi şəxsiyyət, görkəmli siyasət və dövlət xadimi olmasından, həyata keçirdiyi böyük işlərindən danışdı. Natiq qeyd etdi ki, bu dahi insan Azərbaycan xalqının yaddaşında qurucu və xilaskar dövlət xadimi, milli lider və xalq məhəbbətini qazanan öndər kimi qalacaqdır.

Məruzəçi çıxışında qeyd etdi ki, müstəqil Azərbaycanın gələcək inkişaf perspektivlərini müəyyənləşdirmiş ümummilli lider Heydər Əliyevin yaratdığı bütün bu milli sərvətin inkişaf etdirilməsi ənənələri hazırda Azərbaycan Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir.

"Azərbaycanda multikulturalizm dəyərlərinin inkişafında Heydər Əliyevin rolu" mövzusunda məruzə edən baş müəllim, tarix üzrə fəlsəfə doktoru Əlizadə Nəcəfov ümummilli liderimiz Heydər Əliyevin siyasi fəaliyyətindən danışdı.Məruzəçi gənc nəslə ən böyük örnək olan Heydər Əliyev şəxsiyyətinin ayrı-ayrı komponentlərindən bəhs etdi və bildirdi ki, Onun yüksək mənəvi keyfiyyətlərə sahib olması xarakterindəki bütövlük, şəxsiyyətinin davamlılığı və Vətəninə, xalqına sədaqəti ilə müəyyənləşir. Əsl vətəndaş olmaq üçün Vətəni və xalqı Heydər Əliyev kimi sevmək, onun mənəvi dəyərlərinə sahib çıxmaq gərəkdir.Xalqımızın ümummilli lideri Heydər Əliyevin milli-mənəvi dəyərlərimizin qorunmasında, xalqın milli özünüdərki sahəsində gördüyü işlərdən danışdı. Ə.Nəcəfov Heydər Əliyevi mənəvi-əxlaqi keyfiyyətlərinə və siyasi addımlarına görə məğlubedilməz bir sərkərdəyə bənzətdi. O, qeyd etdi ki, Heydər Əliyev kimi məğlubedilməz sərkərdəsi olan xalq həmişə yaşayacaq və öz dəyərli oğullarını əbədiyyət evinədək yaşadacaqdır.

"Heydər Əliyev və milli təhsilimiz" mövzusunda məruzə edən filialın dosenti Seymur Süleymanov ulu öndərimiz Heydər Əliyevin Azərbaycan təhsilinə göstərdiyi diqqət və qayğıdan danışdı. Heydər Əliyevin milli təhsil və tərbiyə məsələlərinə dair nəzəri konsepsiyasını yüksək qiymətləndirən S. Süleymanov bu konsepsiyanı hər bir təhsilalanın, hər bir pedaqoqun, ümumən, hər bir Azərbaycan vətəndaşının fəaliyyət devizi, həyat amalı adlandırdı.

Konfransda yekun sözü ilə çıxış edən dosent M.Fərzəliyeva bildirdi ki, bu gün biz ulu öndərimiz Heydər Əliyevin şərəfli həyat yoluna nəzər saldıqca gördük ki, Onun bir lider, ictimai-siyasi xadim kimi fəaliyyəti mənsub olduğu xalqın taleyi ilə sıx bağlı olmuş, onun azadlığı, rifahı və müstəqil dövlətçiliyi üçün var gücü ilə çalışmışdır.

Sonda ulu öndər Heydər Əliyevin həyat və fəaliyyəti haqqında sənədli film nümayiş etdirildi.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İnsan və heyvan fiziologiyası kafedrasının dosenti Laura Həsənovaya, qardaşı

**Həsən Həsənovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

**Redaktor əvəzi:** Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az Fotolar Nurlan Səmədovundur Şəhadətnamə № 191

Sifariş: 1669 Sayı: 1500 Çapa imzalanıb: 31.05.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.